İBN TEYMİYYƏ

# Vasitiyyə əqidəsi

Rus dilindən tərcümə edən
Fərahim Sələfi

Furqan 2007

## Redaktordan

Həmd Allaha məxsusdur. Peyğəmbərimiz Muhəmmədə onun ailəsinə və əshabələrinə Allahın salavatı və salamı olsun!

Müsəlman bacı və qardaşlar! Şeyxülislam İbn Teymiyyənin yazdığı "Vasitiyyə əqidəsi" əsəri qısa həcmli olmasına baxmayaraq onun hər bir kiçik cümləsi hər hansı zəlalət firqəsinə cavabdır. O burada Allahın ad və sifətləri ilə bağlı cəhmiyyə, müşəbbihə və sairələrinə, səhabələrlə bağlı rafizilərə, zalım və ya ədalətli imama itaətlə bağlı xəvariclərə, övliyalarla bağlı sufilərə və digər bidətçilərə Quran, Sünnə və sələf fəhmi ilə aydınlıq gətirmişdir.

Rus dilindən tərcümə edilmiş əsərin redaktəsi zamanı görülən işlər aşağıdakılardan ibarətdir:

Rus tərcüməçisi tərəfindən ərəb orijinalına əlavə edilmiş əksər cümlələr ləğv edilmişdir. Təbii ki, o, bu cümlələri açıqlama məqsədilə yazmışdı. Çünki günümüzdə yaşayan müsəlmanların elmi səviyyəsi orta əsrlərlə müqayisədə çox aşağıdır. Lakin bildiyiniz kimi bu, belə bir üslubla deyil, sətiraltı izahlar vasitəsi ilə həyata keçirilməlidir. Ona görə də kitabın üzərində işləyən şərhçi, redaktor, tərcüməçi və sairə şəxslər orijinal mətnə xələl gətirmədən öz qeydlərini oxucunun fərqləndirə biləcəyi xüsusi formada yazmalıdırlar. Əks təqdirdə bu, orijinaldan xəbəri olmayan oxucunun müəllifin demədiyi bir sözü əsas götürməsinə səbəb olur. Hal-hazırda İslamla bağlı ədəbiyyata maraq göstərən əksər insanlar kitabın müəllifinin tanınmış və etibarlı olduğunu və ya onu maraqlandıran mövzuya həsr edildiyini əsas götürürlər. Lakin onlar tərcüməşinin peşəkarlığını, əqidəsini və s. nəzərə almırlar.

Əsəri rus dilinə tərcümə edən naməlum şəxs sətiraltı qeydlər vasitəsi ilə də əsərə müəyyən izahlar yazmışdır. Həmin izahlardan bəziləri Əhli sünnə və camaat tərəfdarlarının öz kitablarında, istər İbn Teymiyyədən əvvəl istərsə də sonra yazdıqlarına ziddir. Onun belə sətiraltı qeydlərindən birini (27) təqdim edirik: **Allahın sifətləri haqqında ancaq düşünmək olar, cünki onlar barədə o qədər mübahisə və ziddiyətlər var ki, bəzi adamlar onları tamamilə inkar etdikləri halda, digərləri onlara maddi keyfiyyətlər kimi yanaşır, onlara forma verir, məsələn, "Allahın Üzü" və ya "Allahın Gözləri" və yaxud "Allahın Əli" və s. Mən belə hesab edirəm ki, bu sifətləri məcazi mənada izah edərək, onlara forma verilməməli, onları inkar etməməli, başqa sözlə desək, o sifətlər qüdrət, mühafizə, baxmaq və eşitmək mənalarını verdikdə "necə" sualı verilməməlidir. Bu sifətləri xatırlamaqdan məqsəd – məhdud ağlımızın Allahı necə dərk etmək barədə yollar axtarması və Onunla necə əlaqə yaratmağa bu məhdud ağlımızı yönəltməkdən ibarətdir, əks təqdirdə biz necə ümid edə bilərik ki, Allah Özü Özünü bizə təsvir etsin?** "

22-ci sətiraltı qeyddə isə yazmışdır: **"Bəzi şərhlərə görə Allahın üzünü görəcəklər"** Halbuki bu şərh, Səhih Muslimdə Peygəmbərin (Ona Allahın salavatı və salamı olsun) dilindən söylənilib və bu Əhli Sünnənin verdiyi şərhdir.

Başqa bir qeyddə isə (29) deyir: **“*Murciə* (murciələr) – İslamda ən ilk təriqətlərdən birinin adıdır, xəvariclər (xaricilər) təriqətinin ifratçı əleyhdarlarıydılar. Sonuncular hesab edirdilər ki, müsəlman böyük günah işlətdikdə kafir olur. Murciəçilər isə, əksinə, belə rəydə idilər ki, müsəlman günah işlətdikdə imanını itirmir. Bu təlim onları siyasətdə uzağa gedən kvietizmə – seyirçiliyə (fəal yaradıcılıqdan imtinaya, xeyir və şərə etinasızlıq göstərməyə, iztirablarla barışmaya) qapılmağa apardı; onların təliminə görə, böyük günaha yol vermiş imam İslamdan çıxmır və ona etimad göstərmək lazımdır, onun arxasında qılınan namaz qəbul olunur.”**

Sonuncu cümlə yəni, **”...onların təliminə görə, böyük günaha yol vermiş imam İslamdan çıxmır və ona etimad göstərmək lazımdır, onun arxasında qılınan namaz qəbul olunur”** sözləri, murciələrə deyil, Əhli sünnə və camaat tərəfdarlarına məxsusdur. Murciələrə görə böyük günah etmiş imama qarşı qiyama qalxmaq icazəlidir. Ibn Şahin “əl-Lətif” kitabında (15) Süfyan əs-Sövrinin aşağıdakı sözləri dediyini nəql etmişdir: “Mən necə murciə sayıla bilərəm?! Axı mən qılıncla qiyamı düzgün hesab etmirəm.” Həmçinin İmam Lələkəi “Şərh usul əl-etiqad Əhli Sünnə vəl-camaati” (5/999) kitabında Süfyan əs-Sövrinin belə dediyini rəvayət etmişdir: “Murciələr müsəlmanlara qarşı qılınc qaldırmağı düzgün hesab edirlər”. İmam əs-Sabuninin “Əqidətus-sələfi ashəbul-hədis” (84) kitabında Əhməd ibn Səid ər-Ribati demişdir: “Abdullah ibn Tahir mənə dedi: Ey Əhməd, siz bu adamlara yəni, murciələrə onları tanımadan nifrət bəsləyirsiniz. Mən isə onları yaxşı tanıdığıma görə nifrət edirəm. Əvvəla onlar rəhbərə itaət göstərilməsini düzgün hesab etmirlər...”.

Kitabın üzərində aparılan işlərdən biri də ərəb orilinalında olmasına baxmayaraq rus dilinə tərcümə edilməyən hədislərin mətndə yerləşdirilməsidir. Belə hədislərdən biri də aşağıdakıdır: “Ən əfzəl iman, harada olsan Allahın səninlə olmasını bilməndir” Həsən hədisdir.

Bildirməliyəm ki, “Vasitiyyə əqidəsi” əsəri çox qısa bir müddət ərzində tərcümə və redaktə edilmişdir. Bu səbəbdən də onu oxuyan müsəlman bacı və qardaşlarımızın hər hansı irad və təkliflərini böyük məmuniyyətlə dinləməyə hazırıq.

Şeyx Useymin (Allah ona rəhmət etsin) demişdir: “Tərcüməçi olmaq üçün dörd şərt vardır: “Əmin-aman insan, tərçümə edəcəyi hər iki dili və həmçinin tərcüməyə hazırladığı əsərin mövzunu bilən alim”. (“Vasitiyyə əqidəsi” kitabının şərhi, 2/36)

Şükr və təriflər Allaha məxsusdur.

Ramil Həsənov

Mərhəmətli və Rəhimli Allahın adı ilə!

**İbn Teymiyyənin tərcümeyi-halı**

### *İbn Teymiyyənin uşaqlıq və yeniyetməlik dövru*

Hicrətin - Muhəmməd Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) və Onun səhabələrinin Məkkədən Mədinəyə köçdüyünün 7-ci əsri idi. Dövr özünün həqiqi alimini gözləyirdi ki, o gəlib müsəlmanların sosial, intellektual, mənəvi və siyasi həyatını yaxşılaşdırsın və islah etsin.

Həqiqi bir alim lazım idi ki, müsəlmanları nadanlıq zülmətindən çıxarıb onlara getdikləri yolda Quranın və Sünnənin əhəmiyyətini göstərə bilsin. Müsəlmanlara elə bir əsil müəllim lazım idi ki, o, təkcə öz kitablarına qapılıb qalmayaydı, kitabları üçün material və faktlar toplamaqla qane olmayaydı, insanlara fil sümüyündən ucaldılmış qülləsinin yüksəkliyindən baxmayaydı. Onlara elə bir alim lazım idi ki, o, əlində bayraq irəli çıxıb, heç nədən qorxmayaydı. Müsəlmanlara elə bir həqiqi müəllim lazım idi ki, o, onların dində yeniliklərə dair olan xülyalarının puç olduğunu sübut edə biləydi və bu müsəlmanların şəxsiyyətini Quran və Sünnə işığında yenidən bərpa edə biləydi ki, onların dinini və ümməti – müsəlman icmasını qoruya biləydi.

O vaxtlarda Suriyada İbn Teymiyyə ailəsi müxtəlif İslam elmlərində öz bilikləri ilə geniş miqyasda tanınırdı. Şeyxülislam Məcdəddin Əbdüssalam, İbn Teymiyyənin babası, öz zamanının nadir şəxsiyyətlərindən, İslam hüququnun və onun prinsiplərinin ən yaxşı bilicilərindən idi, hədisləri – Muhəmmədin (*ona Allahın salavatı və salamı olsun!*) sözləri və əməllərindən bəhs edən və İslam icması həyatının müxtəlif dini-hüquqi tərəflərini və bütövlükdə İslam elmini əks etdirən rəvayətləri çox gözəl bilirdi, Quranı əzbərdən gözəl oxuyurdu və onun təfsirlərini bilirdi. Şeyx Şəhabəddin Əbdülhəlim, İbn Teymiyyənin atası, görkəmli imam – ruhani rəhbər, müsəlman icmasının başçısıydı. O, imam Əhməd ibn Hənbəl məzhəbi hüququnun bilicisiydi. O həmçinin bir çox digər İslam elmləri üzrə məşhur alimdi, Dəməşqdə Hədis Məktəbinin şeyxi oldu və habelə Dəməşqin Baş məscidinin cümə günləri kafedrasına rəhbərlik edirdi.

Taqiəddin Əbülabbas Əhməd ibn Əbdülhəlim ibn Əbdüssalam ibn Teymiyyə, məşhur alimin nəvəsi və özü də alim, hicrətin 661-ci ilinin Rabiələvvəl ayının 10-da bazar ertəsi günü (xristian təqviminə görə 22 yanvar 1263-cü ildə) Harranda (Şimali Suriya) anadan olmuşdur. Tatar-monqollar ilk dəfə olaraq müsəlman dünyasına basqın etdikləri və artıq Harranın həndəvərlərində olduqları vaxt İbn Teymiyyənin atası ailəsi ilə Dəməşqə köçdü. O zaman İslam elmlərinin mərkəzi olan Dəməşqdə Əhməd İbn Teymiyyə İslam elmləri sahəsində alim olan atasının yolu ilə getdi. O, öz zəmanəsinin böyük alimlərinin yanında dərs almağa başladı. Həmin alimlərin arasında Zeynəb bint Məkki adlı bir qadın da var idi ki, ona hədis elmini öyrətdi.

O, öz təhsilini yeniyetmə yaşında bitirdi və 19 yaşında İslam elmləri professoru oldu. Quran elmlərindən, hədislərdən, fiqhdən, ilahiyyatdan, ərəb qramatikasından və kəlamdan və b. mükəmməl məlumatı olan İbn Teymiyyə dini

hüquqi məsələlər üzrə, ənənəvi Hənəfi, Maliki, Şəfii və Hənbəli hüquqi məktəblərindən hər hansı birini əsas götürmədən, fitvalar verməyə başladı.

O, dilçiliyi və hesabı məktəbdə öyrənmiş, Quranı əzbərləmiş, imam Əhmədin "əl-Müsnəd"ini və habelə əl-Buxari, Müslim, Əbu Davud, ən-Nəsai, ət-Tirmizi və İbn Macənin *hədis* toplularını öyrənmişdir. O, 200-dən çox alimin *həsislərini* toplamışdır. Bütün bunlara o, hələ 16 yaşı tamam olmamış, nail olmuşdu. Onun ağlı və yaddaşı Dəməşq camaatını heyrətə salırdı. O, 19 yaşında müfti oldu. Atasının ölümündən sonra onun əvəzinə Quranın şərhindən və imam Əhmədin məzhəbindən dərs deməyə başladı. Onun dərslərində atasının yaşıdları belə gəlib oturub mühazirələrinə qulaq asırdılar. O, elmi mübahisələrə başlayanda, həmişə öz tərəf müqabillərini dediklərinə inandırırdı. Heç kim İslam tarixində İslamda məzhəblərin arasında olan ziddiyyətlər, müxtəlif axınların tənqidi, antiislam və fəlsəfi ideologiyaların tənqidi sahəsində İbn Teymiyyənin əsərlərinin  qoyduğu təsiri qoya bilməmişdir. Onun yazdığı əsərlərin sayını hesaba almaq mümkün deyildir. Nə ondan əvvəl gələn və nə də ondan sonra gələn alimlər onun yazdığı qədər əsər yazmamış, baxmayaraq ki, o, həmin əsərlərin çoxunu yaddaşına əsaslanaraq və həbsxanalarda olarkən qələmə almışdır. Onun ancaq fitvaları 38 cilddə toplanmışdır. İbn Dəqiq əl-İd demişdir: "Biz İbn Teymiyyə ilə görüşərkən, mən elə bir insanı gördüm ki, sanki bütün elmlər onun gözü qarşısında idilər".

### *İbn Teymiyyə erasının siyasi və sosial şəraiti*

İbn əl-Tahir, İbn Teymiyyənin yaşadığı dövrün müsəlman aləmindəki siyasi və hərbi vəziyyətini belə təsvir edir:

"O zaman İslam və müsəlmanlar heç bir digər millətin sınamadığı məhrumiyyətlərə məruz qalırdılar. Bu bəlalardan biri tatar-monqolların basqını idi. Onlar şərqdən gələrək ərəb xilafətinə böyük zərbə vurdular. Digər bir fəlakət fransız və alman səlibçilərinin qərbdən Mesopotamiyaya və Misirə hərbi yürüş etmələri idi. Onlar limanları işğal etmiş və az qala bütün Misiri ələ keçirmiş, lakin Allahın lütfi sayəsində məğlubiyyətə uğramışdılar. Lakin digər bir bəla ondan ibarət idi ki, müsəlmanların öz aralarında ixtilaf düşmüşdü və onlar öz qılınclarını öz həmvətənlərinə qarşı qaldırmışdılar.

Müsəlmanlar, Muhəmməd Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun*!) təbliğ etdiyi İslam və saleh sələflər, üz-üzə gəldikləri bu dəhşətli siyasi və hərbi şəraitdən başqa, həm də haqdan uzaqlaşmış təriqətlər tərəfindən də ciddi hücumlara məruz qalırdılar. Əl-Qəzalinin təlimlərini rəhbər tutan sufi hərəkatı, İslamı yenicə qəbul etmiş çoxsaylı müsəlmanları özlərinə cəlb edir və əksər insanların düşüncəsinə və təfəkkür tərzinə güclü təsir göstərirdilər. Bundan başqa, əl-Əşari təlimi, İbn Teymiyyənin müasirləri olan əksər alimlər tərəfindən geniş şəkildə qəbul edilmişdi.

*Əl-Əşarinin* təlimi vəhydən ibarət ilahiyyat elminə [1] əsaslanan *sələfi* metodologiyasının *mötəzilələrin* təfəkkürə istinad edən *kəlamçılıq* metodologiyası ilə qovuşdurulmuş sintezi idi. Bu təlimdə *təqlid* - ənənəvi İslam həyat tərzinə və təfəkkürünə *formal*[2] mənsubiyyət geniş tətbiq edilirdi. Hərçənd dinə, fiqhə (İslam hüququ), hədislərə və s. dair xeyli məlumatların olmasına baxmayaraq, alimlərin və sadə insanların çox az bir hissəsi biliklərin mənbəyi və onların yayılması üsulları ilə maraqlanırdılar. İnsanların əksəriyyəti isə öz şeyxinin və ya imamının təlimini korkoranə qəbul edərək, bütün bu məlumatların haradan əldə edilməsi ilə maraqlanmırdılar.

İbn Teymiyyə isə pak peyğəmbər ənənəsi uğrunda, Qurandan və Sünnədən götürdüyü və onun zəmanəsinin insanlarının əvvəllər xəbərləri olmadıqları, dəlillərlə mübarizə aparırdı. Onun sərbəst müsahibə, müzakirə və təhlil etmək istedadı ənənəvi mötədil məktəblərə mənsub alimlər arasında ona qarşı çoxlu düşmənlər qazandırdı. Bu mötədil alimlər onu bidətin bütün çeşidləri üzrə günahlandırırdılar. Onların arasında orta əsrlərin məşhur müsəlman səyahətçisi İbn Batuta da vardı ki, o Dəməşqə gəldiyi zaman İbn Teymiyyə həbsxanada olmuşdur. Belə bir vəziyyət İbn Batutanın öz kitabında "mən şahidəm ki, İbn Teymiyyə minbərdə ayaq üstə dayanaraq demişdir: "Mən endiyim kimi, Allah da hər gecə aşağı göyə enir" və o minbərdən bir pillə aşağı düşdü"[3]. Lakin aşağıda "Vasitiyyə əqidəsi"əsərini oxuduqda biz biləcəyik ki, İbn Teymiyyə, Allahın sifətlərini keyfiyyətə varmadan (ərəbcə, bi-lə keyfə) qəbul etmişdir. O, onun zamanında bütün müsəlman dünyasında geniş yayılmış dində bidətlə - yeniliklərlə, xüsusilə bir sıra sufi təriqətlərinin hərəkət və inancları ilə: övliyalara ibadət etməyə və onların qəbirlərini ziyarət etməyə, özünü oda atmağa qarşı mübarizə aparmışdır. Onun sufilərə etdiyi həmlələri, sufi şeyxlərinin təsiri altına düşmüş hakimiyyət başçıları ilə problemlərin yaranmasına səbəb oldu.

İbn Teymiyyənin mübarizəsi təkcə sufilərlə və bidətçi yeniliklərin ardıyca gedən insanlarla məhdudlaşmırdı. Bundan başqa o, həm də müsəlman dünyasına təcavüz etmiş və az qala Dəməşqə qədər gəlib çatmış tatar-monqollarla da döyüşürdü. Suriya camaatı onu Misirə göndərdilər ki, Misirin və Suriyanın sultanı olan sultan Məmlüki öz qoşunlarını Suriyaya yeritməyə və onları tatar-monqol hücumundan xilas eməyə inandırsın. O, sultanın qoşunlarını göndərməyə tərəddüd etdiyini görəndə, onu bu sözlərlə qorxutmağa başladı: "Sən Suriyadan üz döndərsən, biz başqa bir hökmdarı dəvət edərik ki, onu müharibə günlərində müdafiə etsin və dinclik günlərində isə ona sahib olsun". O, Ramazan oruc ayı zamanı baş vermiş Dəməşq yaxınlığındakı Şihab uğrunda gedən döyüşlərdə iştirak etmiş və Muhəmməd Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) Məkkəni azad etdiyi zaman elədiyi kimi, düşmənə qarşı vuruşanlara kömək məqsədilə orucluğu təxirə salmaq barədə fitva da vermişdir. Müsəlmanlar tatar-monqollara qarşı bu döyüşdə qələbə çaldılar və onları Dəməşqdən və bütün Suriyadan qovdular. İbn Teymiyyə öz cəsurluğunu, "üləmaların" nümayəndə heyəti ilə birlikdə müsəlmanların üzərinə qəfil basqınlarına son qoymaları üçün

---

[1] Bu, ərəbcədən rus dilinə tərcümə edənin ifadəsidir. Əslində Allahın Quranına və Onun Peyğəmbərinin (s.a.s.) Sünnəsinə əsaslanan ilahiyyat elmi nəzərdə tutulur. Tərc. F.S.

[2] Tərc. əlavəsi. F.S.

[3] İbn Batuta, "Ruhaya", c. 1, s. 110.

Qazanda yerləşən tatar-monqol xanı ilə danışıqlara gedərkən göstərdi. "Üləmalardan" heç biri, İbn Teymiyyədən başqa, cəsarət edib xana bir söz belə deyə bilmədilər. O isə dedi: "Siz özünüzü müsəlman elan etmisiniz və sizin müəzzinləriniz, qaziləriniz, imam və şeyxləriniz vardır. Bəs siz niyə bizim ölkəmizə basqın etdiniz? Hələ sənin atan və baban, Xulaq, kafir olduqları zaman belə İslam torpaqlarına basqın etmirdilər, onlar hətta basqın etməyəcəklərinə söz vermişdilər və buna əməl də etdilər. Sən isə vədə verdin, amma onu yerinə yetirmədin"[4].

İslam düşmənlərinə qarşı bu cihad İbn Teymiyyənin "üləmalarla" olan münasibətlərinə kömək göstərmədi. Hakimiyyət, çoxsaylı hüquqi və sosial məsələlər üzrə cəsarətli və mütərəqqi baxışları (*onu sevməyənləri, İslam hüququnun mötədil məktəblərinin ardıcıllarını qəzəbləndirirdi*) üstündə onu dəfələrlə zindana salırdı və axırda orada o, vəfat etdi.

Amma, İbn Teymiyyə "üləmalar" arasında onu hər cür fəlakətə məruz qoyan və dəfələrlə həbsə atdıran qərəzli tənqidçilərini cəzalandırmaq imkanına malik olduqda (sultan ən-Nəsir Kələun ona belə bir imkan vermişdi), o, böyük alicənablıq göstərərək onları bağışladı. Bununla əlaqədar o sultana demişdi: "Əgər sən onları öldürsən, bir də heç vaxt onlara bənzər "üləma" tapa bilməzsən". Sultan isə ona belə demişdi: "Onlar sənə hədsiz dərəcədə ziyan vurmuşlar və səni öldürmək istəyirdilər!" İbn Teymiyyə sultana belə cavab vermişdi: "Mənə ziyan vuranlar bağışlanmışdır, amma kim ki, Allahın və Onun Peyğəmbərinin işinə ziyan vurub, onu Allah cəzalandıracaq"[5].

Müsəlman tarixçiləri əz-Zəhəbi, İbn Kəsir, İbn əl-İməd əl-Hənbəli və bir çox digərləri İbn Teymiyyəni haqlı saymış və onu İslamın ən böyük alimlərindən hesab etmişlər.

### *İbn Teymiyyənin elmi nailiyyətləri*

İbn Teymiyyə zamanında müsəlmanların vəziyyəti ağır idi və onların məhz bu vəziyyətini o, yaxşılaşdırmaq istəyirdi. O olduqca yüksək fəallıqla öz dinini – İslamı müdafiə edirdi. Demək olar ki, özünün bütün əsərlərində o, İslama sızdırılmış dinə yad olan ideyaları ya tənqid, ya da təkzib etmiş və yaxud, onun rəyinə görə, müsəlman ümmətinin diqqətini cəlb etmək lazım gəldiyi üçün bəzi nəzər nöqtələri müdafiə etmişdir.

İbn Teymiyyənin İslamın müdafiəsində fəal rolunun ən parlaq nümunəsi, onun, tatar-monqolların müsəlman torpaqlarına basqını zamanı göstərdiyi fəaliyyətidir. İslam tarixi üçün ən böhranlı dövr olan həmin vaxtlarda, o, ideoloji və vətənpərvərlik ruhunun mənbəyi olmuşdu. O, Cihadın – din uğrunda mübarizənin zəruri olduğundan danışır və izah edirdi ki, bu - ən birinci dərəcəli mühüm vəzifədir. Özünün bəlağətli nitq qabiliyyətindən və fikirlərini yazılı surətdə ifadə etmək istedadından istifadə edərək, o, var qüvvəsi ilə müsəlmanların əxlaq səviyyəsini

---

[4] İbn Kəsir, *Əl-Bidayə vən-Nihayə,* c. 7, h. 14, səh. 91-92.
[5] İbn Kəsir, *Əl-Bidayə vən-Nihayə,* c. 7, h. 14, səh. 56.

müdafiə edir və onların birləşməsinin zəruriliyini, İslamın və imanın mahiyyətini dərk etmənin zəruriliyini, İslamın həqiqiliyinə iman gətirilməsinin, onların Şanlı və Uca Allaha baxışlarının doğruluğunun zəruriliyini və habelə, onların dini və sosial şüurluluğunun zəruriliyini xüsusilə qeyd edir.

Hərbi münaqişələr zamanı İbn Teymiyyə misirliləri inandıra bildi ki, monqol ordularının təzyiqinə məruz qalan Suriyaya kömək üçün qoşun göndərsinlər. Bu zaman o bunun müsəlmanların islami vəzifəsi olduğunu deyirdi. Sonra o, tatar-monqollara qarşı şəxsən mübarizəyə qatıldı və Şanı Uca Allah Öz köməyi ilə müsəlmanlara qələbə qazandırdı. Döyüşlər zamanı İbn Teymiyyə həmişə cəbhənin ön xəttində kafirlərlə mübarizə aparırdı və onun 702-ci hicri ilində (1304 x.i.) Şihab döyüşü zamanı şücaəti və igidliyi əfsnəyə çevrildi.

O, İslam dinini nəinki hərbi, həm də ideoloji cəbhədə müdafiə edirdi. İbn Teymiyyənin əqidə cəbhəsində əsas düşmənləri sufilər, tərkidünyalığı təbliğ edən və müsəlman mərasimlərini inkar edən zahidlər, həyatdan və təcrübədən təcrid olunmuş kəlamçılar – filosoflar idilər.

O, panteist sufi ideyasını – Allahı təbiətlə eyniləşdirən və təbiəti ilahi təcəssümü sayan fəlsəfi təlimi qəbul etmirdi. O, qnostiklərin[6] - özündə yunan idealist fəlsəfəsi ilə xristian əhkamlarının və ümumi dini mütiliyə determinist baxışlı şərq dinlərinin birləşməsindən ibarət olan ideyalarını – erkən xristianlığın dini-fəlsəfi cərəyanını da qəbul etmirdi. O belə hesab edirdi ki, bu ideyalar İslam ümmətinə dağıdıcı təsir göstərir, çünki onlar müsəlmanları siyasi süstlüyə, dini anlaşılmazlıqlara, icmanın fəal həyatından uzaqlaşmağa aparır. O, zehni fəaliyyətinin əhəmiyyətli bir hissəsini sufilik təliminin təkzibinə sərf etmişdir.

İbn Teymiyyə şiələri də kəskin tənqid etmişdir, çünki onların təlimində və dinində çoxsaylı nöqsanlar vardı. O onların tarixi faktları saxtalaşdırmasını və Sünnəni təhrif etməsini də qətiyyətlə ittiham edirdi.

İbn Teymiyyə həmçinin əl-Cəhmiyyənin, əl-Cəbriyyənin və insanın öz əməllərindən ötrü cavab verəcəyini inkar edən deterministlərin[7] əleyhinə çıxırdı. O, mötəzilə və qədəriyyə, insanın xeyirxah iradəsini onun əməllərinin əsası sayan və əqli yeganə idrak vasitəsi hesab edən idealistləri (rasionalistləri) də tənqid edirdi. O habelə, determinizmə aid müxtəlif məsələlər və İslam dininin digər məsələləri üzrə Əbu əl-Həsən əl-Əşarinin ardıcıllarının təlimlərinə qarşı mübarizə aparırdı.

Sufilərə və kəlamçılara qarşı apardığı mübarizə nəticəsində İbn Teymiyyə özünə onların arasında çoxsaylı düşmən qazandı. Onların siyasətlə məşğul olan əksər liderləri bunu onun əleyhinə istifadə edirdilər. Nəticədə, o bir dəfə İskəndəriyyəyə sürgün edilmiş və üç dəfə isə müxtəlif səbəblərə görə həbsxanaya salınmışdı. Əsərlərini qadağan etməklə yanaşı, onun son üç həbsi dövründə ona oxumaq, yazmaq və ailəsi, dostları ilə görüşməyi belə qadağan etmişdilər.

Onun çoxsaylı əsərləri arasında "əl-Ubudiyyə" (ərəb feli *"abada"* – dan - **"sitayiş etmək, diz çökmək", "pərəstiş etmək")** xüsusilə fərqlənir**.**

---

[6] **Qnostiklər** – Özlərini şərin mənbəyi olan (qnostiklərin rəyinə görə) materiyaya qarşı qoyan dərkedilməz ruhu ilk başlanğıc kimi qəbul edirdilər. (Fəlsəfə ensiklopedik lüğəti, Bakı, 1997, s. 91.) Tərc.

[7] **Deterministlər –** Determinizm bütün hadisələrin ən ümumi, qanunauyğun əlaqəsi, səbəbiyyət asılılığı haqqında *təlimə* deyilir. Tərc.

Ola bilsin ki, oxucu ərəb sözü olan *"abd"*-ın "qul" və "ibadət edən" mənaları verdiyini bilir. Bu kitabda İbn Teymiyyə anlaşıqlı dillə "qul" və "ibadət edən" sözlərinin nəinki fərqini izah edir, o həm də İslamda ibadətin nə olduğu barədə ətraflı surətdə bəhs edir.

Onun ilahiyyat elminin mahiyyəti ondan ibarətdir ki, bütün yaradılmış üzvi və qeyri-üzvi məxluqlar, "ibad Allah"-dır – yəni Allaha ibadət edən qullardır. Lakin "ibad" (qullar)[8] iki qrupa bölünür: qeyr-ixtiyari qullar və öz iradəsi ilə qul olanlar. Əlbəttə ki, heyvanlar, bitkilər və minerallar birincilərə aid olduqları halda, insanlar öz "qulluq" münasibətlərini müəyyən etməkdə sərbəstdirlər. Başqa sözlə desək, iki gerçəklik mövcuddur: kainata məxsus (universal) gerçəklik və dini gerçəklik. Allahın bütün qulları kainat gerçəkliyinə məxsusdurlar. Onların pis və ya yaxşı, dindar və ya kafir, varlı və ya kasıb olmasından asılı olmayaraq, onlar, Allahın kainatı yaratdığı qanuna məruz qalırlar, yəni nəfəs alır, yeyir, yatır və s. və i.a. Lakin dini gerçəklik isə Allahın Qanunlarını könüllü surətdə qəbul etmək və Əzəmətli və Uca Allahı, Onun Elçisini (*ona Allahın salavatı və salamı olsun!*) sevmək, Ona, İslama itaət etmək uğrunda könüllü mübarizədir. Ancaq həqiqi abd (ibadət edən qul) bu iki həqiqəti qəbul edir, onları yadında saxlayır və dini gerçəkliyin – Əzəmətli və Uca Allahın Qanunlarının tələblərini yerinə yetirməyə səy göstərir. Beləliklə, elə buradan məlum olur ki, niyə bəzən dini mətnlərdə abd sözü bəzən "qul" kimi, bəzən də "ibadət edən" kimi işlədilir. Məhz İslamı seçməsi "abdı" – qulu "abda" – ibadət edənə çevirir.

İbn Teymiyyənin bu elmi əsərini yaxşı anlamaq üçün bir şeyi yadda saxlamaq lazımdır: İbn Teymiyyə aşkar etmişdir ki, əgər biz azca da olsa, ya qəsdən, ya da, özümüz də bilmədən, doğru yolumuzdan sapsaq, bu bizi getdikcə şirk yoluna – Əzəmətli və Uca Allaha şərik qoşmağa və küfrə - həqiqəti inkar etməyə doğru aparacaqdır.

Daha sonra İbn Teymiyyə sübuta yetirməyə davam edərək bildirir ki, düzgün ibadət etmək üçün şəriət (Allahın Qanunları) yolu ilə getmək lazımdır. Əzəmətli və Uca Allaha düzgün ibadət etmək üçün biz Onun yolu ilə gedərək ancaq Ona ibadət etməliyik, yəni biz şəriət qanunu yolu ilə getməliyik. İbn Teymiyyə iki şəhadəti götürərək, onları İslamın iki əsas prinsipi ilə birləşdirmişdir. Bizə məlum olduğu qədər, imanın şəhadət sözləri olan "lə İləhə illəllah" – "Uca Allahdan başqa ibadətə layiq heç bir məbud yoxdur" ifadəsini bildirir, "və Muhəmməd Rasulullah" sözləri isə "və Muhəmməd – Allahın Elçisidir" mənasını verir və şəriətin mahiyyəti - Muhəmməd Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) şəxsi nümunəsi əsasında ibadət etməkdən ibarətdir və bu yoldan hər hansı sapma şəriətlə bir araya sığmaz.

Düzgün ibadət etmək üçün iki şərtə riayət etmək lazımdır. Birincisi, biz yaxşı əməllərlə məşğul olmalıyıq və bilməliyik ki, əməl Əzəmətli və Uca Allahın Öz Elçisinə (*ona Allahın salavatı və salamı olsun!*) nazil etdiyi Qanununa tabe deyilsə, yaxşı hesab edilməz. İkincisi, hər hansı bir əməli Əzəmətli və Böyük Allahın istəyindən başqa, kiminsə xatiri üçün yerinə yetirmək olmaz. İbn Teymiyyə bizi Quranda göstərildiyi kimi öyrədirdi: İslam dininə seçmə yolu ilə yanaşmaq olmaz.

---

[8] "Qullar" sözü tərcüməçinin qeydidir. Tərc.

Ondan nəyisə götürüb, nəyisə kənara atmazlar. İslam bütünlüklə və tamamı ilə qəbul edilməlidir. İbadətin əsası da elə budur!

İbn Teymiyyə yorulmadan elmə yol göstərmişdir. O yazırdı: “Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) dinin əsaslarını və tətbiq edilməsi yollarını, onun məqsədini və necə izah edilməsini, onun ağılla bağlılığını və təsirini göstərmişdir. Bu, bütün təməl biliklərin və imanın əsasıdır və kim bu prinsiplərə sadiq qalırsa, həqiqəti hamıdan çox bilməyə və düzgün əməl etməyə layiqdir.

Həyatının bütün dönüklüyünə baxmayaraq, İbn Teymiyyə İslam elmlərinin bütün istiqamətlərində çoxlu kitab və məqalələr yazmışdır. Onun şagirdi İbn Qəyyim əl-Cəvziyyə İbn Teymiyyənin işlərinin siyahısını tərtib etmişdir, onlar 350 –dir. Burada onlardan bir-neçəsini göstərək:

I. Quran elmləri və Təfsir

*1.Ət-Təbiyyən fi nuzul əl-Quran*
*2.Təfsir Surət ən-Nur*
*3.Təfsir əl-Muəvizəteyn (113-cu və 114-cü surələr)*
*4.Təfsir Surət əl-İxlas (112-ci surə)*
*5.Muqəddimə fi Usul ət-Təfsir*

II. Fiqh (İslam hüququ)

*1.Məcmuat əl-Fətəva əl-Kubra. 5 cild*
*2.Məcmu əl-Fətəva İbn Teymiyyə. 37 cild*
*3.Əl-Qavaid ən-Nuraniyə əl-Fiqhiyyə*
*4.Kitab Mənasik əl-Həcc*
*5.Risalə fi əl-Uqud əl-Muhərrəmə*
*6.Kitab əl-Farq əl-Mubin beynə ət-Talaq vəl-Yəmin*
*7.Kitab fi Usul əl-Fiqh*
*8.Risalə fi Rəf əl-Hənəfi Yədeyhi fi əs-Salə*
*9.Risalə fi Sucud əs-Sahv*
*10.Məsələt əl-Həlf bi ət-Talaq*

III. Təsəvvüf (Süfizm)

*1.Əl-Furqan beynə Ovliya ər-Rahmən və Ovliya əş-Şeytan*
*2.Əmrad əl-Qulub və Şifauhə*
*3.Ət-tuhfa əl-İraqiyyə fi Amal əl-Qulub*
*4.Əl-Ubudiyyə*
*5.Ər-Risalə ət-Tadmuriyyə*
*6.Dəracət əl-Yəqin*
*7.Baqiyət əl-Murtəd (əs-sabiniye)*
*8.İbtal Vəhdət əl-Vucud*
*9. Ət-Təvəssul vəl-Vasatiyya*
*10.Risalə fi əs-Səma vər-Rəks*
*11.Əl-İbadət əş-Şəriyyə*

IV.Usul əl-Din və İlm əl-Kalam

*1.Risalə fi Usul əd-Din*
*2.Risalə fi əl-İhticac bi əl-Qədər*
*3.Cavab əhl əl-İlm vəl-İman*
*4.Əl-İkliki fi əl-Mutəşabi və ət-Təvil*
*5.Ər-Risalə əl-Mədəniyyə*
*6.Minhəc əs-Sunnə ən-Nəbəviyyə fi Nəqdi Kəlam əş-Şiə -əl-Qədəriyyə*
*7.Əl-Muntaqa min Axbar əl-Mustafa*
*8.Şərh əl-Əqidə əl-Əsfahaniyyə*
*9.Məəric əl-Usul ilə Mərifat ənnə Usulə əd-Din və Fataahu qadd beyyənəha ər-Rəsul*
*10.Əqvamu mə qilə fi əl-Məşiəti və-Hikməti vəl-Qadai vəl-Qədəri və ət-Təlili və Butlani əl-Cəbri və ət-Tətil*
*11.Risalə fi əl-Qadai vəl-Qədər*
*12.Kitab əl-İman*
*13.Əl-Furqan beynə əl-Haqqi vəl-Batil*
*14.Əl-Vəsiyyə əl-Kubra*
*15.Nəqdi Təsis ət-Təqdis*
*16. Ər-Rədd alə əl-Nusayriyyə*

<u>V. Əl-Rədd alə Əshab əl-Miləl: (Başqa dinlərin ardlcıllarına cavab)</u>
*1.Əc-Cavab əs-Səhih limənb bəddələ din əl-Məsih*
*2.Ər-Rədd alə əl-Nəsərə*
*3.Təxcil əhl əl-İncil*
*4.Ər-Risalə əl-Kubrusiyyə*
*5.İktida əs-Sirat əl-Mustəqim Muxaləfət əhsab əl-Cəhm*

<u>VI. Əl-Məntiq vəl-Fəlsəfəh (Məntiq və Fəlsəfə)</u>
*1.Ər-Rədd alə əl-Məntiqiyyin*
*2.Ər-Risalə əs-Səfədiyyə*
*3.Naqd əl-Məntiq*
*4.Ər-Risalə əl-Ərşiyyə*

<u>VII. Əl-Əxlak vəl-Siyasə vəl-İctima: (Davranış, İdarəetmə və Sosiologiya)</u>
*1.Əl-Həsənə vəl-Saiyə*
*2.Əl-Vəsiyə əl-Cəmiyə li xayr əd-Dünya vəl-Əxirə*
*3.Şərh hədis "İnnəmə əl-əl-Əməlu bin-Niyyət"*
*4.Əs-Siyasə əş-Şəriyə fi İslah ər-Rəi və ər-Raiyyə*
*5.Əl-Hizbə fi əl-İslam*
*6.Əl-Məzalim əl-Muştərəkə*
*7. Əş-Şətrənc*

<u>VIII. Hədis</u>
<u>*1.Əhadis əl-Qassas*</u>

## *İbn Teymiyyənin ölümü haqında*

İbn Teymiyyə bilirdi ki, elminə görə həbsxanaya salınması ona əlavə sərbəstlik verir və o, düşünmək və işləmək imkanı yaratdığı üçün həbsə alınarkən sevinirdi. Lakin həbsxanada ondan kitablarını alanda və ona yazmağa icazə verməyəndə (bu onun son dəfə həbsə alındığı zaman baş vermişdi) bu ona ən ağır cəza təsiri bağışladı. İbn Teymiyyə 728-ci hicri ili Zülqədə ayının iyirmisində (26-27 sentyabr 1328-ci m.) Dəməşqdə[9] bazar günü gecəsindən bazar ertəsinə keçəndə həbsxanada vəfat etmişdir.

Ona ehtiram bəsləyənlər çox möhtəşəm bir izdihamla onu dəfn etdilər. Hesablamalara görə bu mərasimdə 200 min kişi və 150 qadın iştirak etmişdi. O, Dəməşqdə anasının basdırıldığı sufi qəbristanlığında basdırılmışdır.

Öz düşmənlərinin ona qarşı hücumlarını şərh edərək, İbn Teymiyyə demişdir: "Bu həyatda əvvəlcə Cənnətə düşmək lazımdır ki, həyata sevinə biləsən: mənim düşmənlərim mənimlə nə edə bilərdilər? Mənim Cənnətim mənim qəlbimdədir; hara getsəm də o həmişə mənimlədir. Mənim həbsxanaya salınmağım – bu ancaq öz-özümlə tənha qalmaq imkanıdır; mənim öldürülməyim – bir şəhidlikdir; mənim ölkədən sürgün edilməyim – məzuniyyətdir".

Özünün son dəfə həbsxanaya salınması zamanı Taqiyəddin İbn Teymiyyə dua ilə Əzəmətli və Uca Allaha belə müraciət etmişdir: "Qüdrətli Allah, mənə yardım et ki, Sənin xeyirxahlığını xatırlaya bilim, Sənə həmd edim, Sənə ixlasla ehtiram göstərə bilim, İnşallah!

---

[9] İbn Teymiyyənin dəfninin təsviri. Bax. İbn Kəsir, səh. 141-145.

# ƏL-ƏQİDƏ ƏL-VASİTİYYƏ[10]
## (Orta əqidə)

Mərhəmətli və Rəhimli Allahın adı ilə![11]

Həmd Allaha məxsusdur[12]. Onu (islamı) bütün dinlərdən üstün etmək (onun bütün dinlərdən üstün olduğunu göstərmək) üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur. (Ya Rəsulum! Sənin peyğəmbərliyinin həqiqiliyinə) Allahın şahid olması kifayət edər!

Şəhadət verirəm ki, Allahdan başqa heç bir haqq ilah yoxdur və Onun şəriki[13] də yoxdur; mən Allahın təkliyini qəbul edir və inanıram.

Şəhadət verirəm ki, Muhəmməd Onun qulu və Elçisidir[14]; ona, onun ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun!

---

[10] Bu dini əqidənin qələmə alınmasının səbəbi. İbn Teymiyyə demişdir: " Adı Hacc Radiyyəddin əl-Vasiti olan Vasitdən (İraqda yerləşir) bir şafii hakimi həccə (ziyarətə) gedən yolda yanıma gəldi. Bu şeyx xeyirxah və iman sahibi olan bir insan idi. O mənə bu ölkədəki (yəni, İrakdakı) tatar-monqol idarəçiliyi altında olan xalqın vəziyyətindən, cəhalətdən, ədalətsizlikdən, imanın və elmin yadırğanmasından giley-güzar etdi.

O məndən xahiş etdi ki, onun həmvətənləri üçün bir əqidə kitabı yazım. Mən ona demək fikrindəydim ki: "Artıq çoxsaylı əqidə kitabları yazılmışdır". Sünnə alimlərinə isinad etdim. Lakin o, öz xahişində inad edərək belə dedi: "Mən sənin yazdığından başqasının əqidəsini istəmirəm". Beləliklə də, mən bunu onun üçün günün ikinci yarısı ərzində yazdım.

Onun çoxlu surətləri Misirdə, İraqda və başqa əyalətlərda yayıldı. *(Məcmu əl-Fətava İbn Teymiyyə, VIII, s. 164).*

[11] Alimlərin (üləmaların) "bismillah" sözü barədə fikirləri müxtəlifdur: o, hər sürənin başlanğıcı olan bir ayədir və yaxud o müstəqil ayə kimi surələri bir-birindən ayırmaq üçün nazil edilmişdir və onunla başlamaq xeyirlidir. İkinci rəy daha üstün tutulur.

[12] ***Əl-Həmdu lil-Ləhi*** (Həmd Allaha məxsusdur): Allahın Elçisindən (ona Allahın salavatı vı salamı olsun!) rəvayət edilir ki, o demişdir:

***"Hər bir söhbət Allaha həmdlə və mənə salavat duası ilə başlanmırsa, naqisdir və mübarək sayılmır"***(Ər-Rəhavi). Eyni hədis "Bismillah" haqqında da rəvayət edilişdir (İbn Hibban).

[13] Lə iləhə illəllah ("Allahdan başqa haqq ilah yoxdur") **Tövhid (**Allahın Təkliyi) düsturudur və bununla bütün elçilər (onlara Allahın salamı olsun!) razılaşmışlar, daha doğrusu, bu, bütün şəriətlərin mahiyyətidir və hər bir elçi, Allahın son Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) kimi, onu öz şəriətinin başlanğıcı və əsas sütunu etmişdir. Peyğəmbərimiz (*ona Allahın salavatı və salamı olsun!*) buyurmuşdur:

***"İnsanlar "Lə İlahə illəllah" deməyincə mənə onlarla döyüşmək əmr olunmuşdu. Əgər onlar bunu desələr, öz canlarını və mallarını məndən qoruyarlar və bundan başqa onlardan qanunla nə tələb olunarsa, Qüdrətli və Böyük Allah Özü onları mühakimə edəcək"*** (Əl-Buxar və Muslim).

[14] Və Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) risaləsinə (şəriətinə) şahidlik etmək. **İbadiyyə** (Allaha xidmət və Ona ibadət etmək) Allahın təkliyi haqqında şəhadət verməklə bağlıdır və bu onu göstərir ki, hər iki şahidlik birlikdə deyilməlidir, onlardan biri digərini əvəz edə bilməz, çünki onlar azanda və təşəhhüddə birləşdirilmişlər. Bəzi insanlar: **«Sənin ad-sanını (şan-şöhrətini) ucaltmadıqmı?!»** ayəsini: "Mən səni harada yad etsəm, sən Mənimlə birgə xatırlanacaqsan" kimi təvil edirlər.

Allah onda (*ona Allahın salavatı və salamı olsun!*) iki cəhəti – elçiliyi və Allahın qulu kimi ibadət etməyi birləşdirmişdir. Çünki bu, hər hansı bəşər məxluqatına verilə biləcəyindən ən üstün olanı idi. Qulluq və ibadət etmək – Allahın Öz məxluqlarını yaratması üçün **səbəb** idi. Belə ki, O buyurur:

**"Mən cinləri və insanları yalnız Mənə ibadət etmək üçün yaratdım!"** (əz-Zariyat, 51/56).

Bu, Qiyamət Gününə qədər məğlubedilməz qalacaq xilas olunmuş tayfanın[15], əhli Sünnə və camaat[16] tərəfdarlarının əqidəsidir. O, Allaha, Onun mələklərinə, kitablarına, elçilərinə, ölümdən sonra dirilməyə, qədərin xeyrinə və şərinə iman gətirməkdən ibarətdir[17].

Allaha imanın bir hissəsi də Onun Kitabında Özünü və həmçinin elçisi Məhəmmədin -ona Allahın salavatı və salamı olsun- Onu vəsf etdiyinə təhrifsiz, inkar etmədən, necəliyinə varmadan və bənzətmədən iman gətirməkdir.

Əhli Sünnə və camaat tərəfdarları Allah barəsində etiqad edirlər ki: **"...Ona bənzər heç bir şey yoxdur. O, (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!"** (Şura, 42/11).

Onlar, Allahın Özünü vəsf etdiyini inkar etmir, sözlərin yerini dəyişdirmir, Allahın adlarından və ayələrindən üz döndərmir, Onun sifətlərinin keyfiyyətinə varmır və məxluqlarının sifətlərinə bənzətmirlər. Çünki nöqsansız Allahın adını daşıyan, bənzəri və tayı-bərabəri olan başqa birisi yoxdur. Məxluqatından heç kim pak və uca Allahla müqayisə edilə bilməz. O, Özünü və başqalarını hamıdan yaxşı tanıyır; Onun kəlamı gerçəkdir və yaratdıqlarının sözündən gözəldir. Allahdan sonra ən doğru danışan və dedikləri təsdiq olunan Onun elçiləridir. Bu həqiqət Onun haqqında heç bir məlumatı olmayan kəslərin dediklərinə ziddir.

---

Buna görə də, məxluqatın kamilləşməsi – bu məqsədə nail olmaqdır və insan Allahın qulu olmağa nə qədər çox can atarsa, onun kamilliyi də bir o qədər artar və onun vəziyyəti daha da yüksələr və məhz buna görə Allah Öz Elçisinə (*ona Allahın salavatı və salamı olsun!*) o, ən yüksək və layiqli səviyyələrdə olduqda, məsələn, əl-İsra (Məkkədən əl-Qüdsə gecə səyahəti) ona **abd** (qul, xidmətçi, ibadət edən) fəxri adını vermişdir. Həmçinin bir səhih hədisdə Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) demişdir:

***"Xristianlar Məryəm oğlu İsaya ibadət etdikləri kimi, siz də mənə ibadət etməyin, mən ancaq bir insanam, ona görə mənə: "Allahı qulu və Onun Elçisi" deyin"".***

[15] Xilas olunmuş tayfa, Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) sözlərinə görə, məğlubedilməz qalacaqdır:

***"Mənim ümmətimdən olan bir qrup haqdan möhkəm yapışacaq və məğlubedilməz qalacaq və ona xəyanət etmişlərdən heç kim Qiyamət gününədək ona ziyan vura bilməyəcək"*** (Əl-Buxari və Müslim). Onun (*ona Allahın salavatı və salamı olsun!*) aşaqıdakı sözləri də buna dəlildir:

***"Bu ümmət 73 hissəyə bölünəcək və mənim və səhabələrimin bu gün getdikləri yolla gedən bir qrupdan başqa, onların hamısı Cəhənnəmə gedəcək"*** (Ət-Tirmizi)

[16] ***Sünnə*** - Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) və onun səhabələri bidətlər (dinə əlavələr) meydana gələnə qədər yaşadıqları həyat tərzidir.

[17] Bu altı bənd – imanın sütunlarıdır və hər bir həqiqi mömin onları Qurana və Sünnəyə müvafiq olaraq qəbul etməlidir. Dinin bu əsasları Cəbrail haqqında olan hekayədə xatırlanır. O (əleyhissalam), səhra ərəbi simasında Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) yanına gələrək ondan İslam, iman və ehsan (Allahı görürmüşük kimi Ona ibadət etmək, çünki biz Onu görməsək də, O, bizi görür) nədir? deyə sual verdikdə, Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) buyurmuşdur: ***"Allaha, Onun mələklərinə, kitablarına, elçilərinə və ölümdən sonra Dirilməyə və qədərin xeyrinə və şərinə iman gətirmək.".***

Elçilər: Quranda onlardan ancaq iyirmi beşinin adı çəkilmişdir, yerdə qalanlarına gəldikdə isə, biz onların hesabına varmadan, adlarını bilmədən onların varlığına inanmalıyıq, çünki Allah onlar haqqında məlumatı, Quranda bildirdiyi kimi, Özündə saxlamışdır:

**"Biz səndən əvvəl də peyğəmbərlər göndərmişdik. Onlardan kimisi haqqında sənə xəbər vermiş, kimisi haqqında xəbər verməmişik..."** (Mömin, 40/78).

Buna görə də əzəmətli Allah buyurur: **“Sənin Rəbbin – yenilməz qüvvət sahibi (mülkündə hər şeyə qalib) olan Rəbbin (müşriklərin) Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır! Peyğəmbərlərə salam olsun! Aləmlərin Rəbbi olan Allaha həmd olsun!”** (Saffat, 37/180-182).

Bu ayədə uca Allah, Elçilərinə müxalif olanların Onun haqqında söylədiklərindən uzaq olduğunu bəyan etmiş, sonra isə eyibsiz və nöqsansız sözlər söylədiklərinə görə elçilərinə salam demişdir.

Nöqsansız Allah Özünün ad və sifətlərini bildirərkən isbat və inkar formalarından istifadə etmişdir. [18]. Elə buna görə də, əhli Sünnə və camaat tərəfdarları elçilərin gətirdiklərindən uzaqlaşmamalıdırlar; həqiqətən, bu doğru yoldur, Allahın Öz lütfkarlığı ilə mükafatlandırdığı kəslərin - peyğəmbərlərin, siddiqlərin, şəhidlərin və saleh insanların yoludur.

---

[18] İki növ inkar vardır: ümumi və xüsusi. Ümumi inkar – Onun Kamilliyini çatışmazlıqlar və qüsurlarla inkar edən hər şeyi Allahdan kənarlaşdırmaqdır. Bununla əlaqədar O buyurur: **“Onun heç bir tayı-bərabəri (bənzəri) də yoxdur!”** və **“Heç Allahın özündən başqa Onun adını daşıyan başqa birisini görmüsənmi?”** və **“Allahı, onların aid etdiklərindən uca tutub şöhrətləndirin”.** Xüsusi inkar – Allahı – atası və ya oğlu, arvadı və ya şəriki və yaxud da Ona bərabəri olmaması ilə, biliksiz, zəif, unutqan, mürgüləyən və ya yuxulayan və yalançı olmaması ilə şərəfləndirmək. Bütün bu inkarlar bunların özünə görə deyil, lakin onların əleyhinə olanları təsdiq etmək üçün zəruridir. Belə ki, şərikin və Ona bərabər olanın inkarı Onun mütləq Əzəmətini təsdiq edir və s.

Təsdiq də iki növdür: ümumi və xüsusi. Ümumi təsdiq Onun Mütləq Kamilliyini, Mütləq Tərifəlayiqliyini və Mütləq Calalını və s.-ni təsdiq edir, çünki Allah buyurur:

**“Həmd olsun Allaha – aləmlərin Rəbbinə”** (Fatihə, 1/1).

Həmçinin:

**“Əlbəttə, doğru olan xəbər budur. Allahdan başqa heç bir tanrı yoxdur. Şübhəsiz ki, Allah yenilməz qüvvət, hikmət sahibidir!”** (Ali-İmran, 3/62).

Quranda və Sünnədə xatırlanan hər bir sifətin adı özündə xüsusi təsdiqi ehtiva edir. Bu adlar çoxsaylıdır və onların hamısını burada qeyd etmək çətindir, amma istəyənlər onları Quranda və Sünnədə tapa bilərlər.

## ALLAHIN QURANDA ADLARI VƏ SİFƏTLƏRİ

Quranın üçdə bir hissəsinə bərabər olan İxlas surəsində Allahın Özünü vəsf etdiyi sifətlər öz əksini tapmışdır. Allah buyurur: **“De: O Allah birdir; Allah möhtac deyildir! O, nə doğmuş, nə də doğulmuşdur! Onun heç bir tayı-bərabəri də yoxdur!”** (İxlas, 112/1-4).

O, Kitabının ən əzəmətli (əl-Kürsi) ayəsində Özünü belə vəsf etmişdir: **“Allahdan başqa heç bir haqq məbud yoxdur. Əbədi, əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər. Göylərdə və yerdə nə varsa, Onundur. Allahın izni olmadan (qiyamətdə) Onun yanında (hüzurunda) kim şəfaət edə bilər? O, bütün yaranmışların keçmişini və gələcəyini bilir. Onlar (yaranmışlar) Allahın elmindən Onun Özünün istədiyindən başqa heç bir şey qavraya bilməzlər. Onun kürsüsü göyləri və yeri əhatə etmişdir. Bunları mühafizə etmək Onun üçün heç də çətin deyildir. Ən uca, ən böyük varlıq da Odur!”** (Bəqərə, 2/255).

Beləliklə, gecələr bu ayəni oxuyanı Allahın göndərdiyi mühafizəçi qoruyar və heç bir şeytan səhərə qədər ona yaxın gələ bilməz.

O, buyurur:

**“Əvvəl də, axır da, zahir də, batin də Odur. O, hər şeyi biləndir!...”** (Hədid, 57/3).

**“Ölməz, həmişə diri olana (Allaha) təvəkkül et ...”** (Furqan, 25/58).

O buyurur:

**“O (hər şeyi) biləndir, hikmət sahibidir!”** (Təhrim, 2)

**“O, hikmət sahibidir, (bəndələrinin bütün əməllərindən) xəbərdardır!”** (Səba, 1)[19]

**“Yerə daxil olanı da, (yerdən) çıxanı da, göydən enəni də, (göyə) qalxanı da O bilir.”** (Səba, 34/2).

O buyurur: **“Qeybin açarları Allahdadır. Onları ancaq O (Allah) bilir. (Allah) suda və quruda nə varsa bilir. Yerə düşən elə bir yarpaq yoxdur ki, (Allah) onu bilməsin. Yerin zülmətləri içində elə bir toxum, (kainatda) yaş-quru elə bir şey yoxdur ki, açıq-aydın kitabda (lövhi-məhfuzda) olmasın!”** (Ənam, 6/59).

O buyurur: **“...O bilmədən heç bir qadın hamilə olmaz və bari-həmlini yerə qoymaz...”** (Fatir, 35/11).

O yenə buyurur: **“...Allahın hər şeyə qadir olduğunu, Allahın hər şeyi elm (Öz əzəli elmi) ilə ehtiva etdiyini biləsiniz...”** (Talaq, 65/12).

O, yenə buyurur: **“Şübhəsiz ki, ruzi verən də, qüvvət sahibi də, yenilməz olan da Allahdır!”** (Zariyat, 51/58).

O, yenə buyurur: **“...Ona bənzər heç bir şey yoxdur. O, (hər şeyi) eşidəndir, (hər şeyi) görəndir!”** (Şura, 42/11).

---

[19] Ibn Useyminin Vasitiyyəyə yazdığı şərhdə Səba surəsinin 1-ci ayəsinin əvəzinə Təhrim surəsinin 3-cü ayəsi yazılıb. (R.H.)

O, yenə buyurur: **“...Həqiqətən, Allahın bununla sizə verdiyi öyüd necə də gözəldir! Əlbəttə, Allah (hər şeyi) eşidəndir, görəndir!”** (Nisa, 4/58).

O buyurur: **“Bağına girdiyin zaman barı: “Maşallah, qüvvət (və qüdrət) yalnız Allaha məxsusdur!” – deyəydin!..”** (Kəhf, 18/39).

O, yenə buyurur: **“...Əgər Allah istəsə idi, onlar bir-biriləri ilə vuruşmazdılar. Lakin Allah Öz istədiyini edər!”** (Bəqərə, 2/253).

O, yenə buyurur: **“...İhramda olarkən ov sizə qadağan edilməklə, adları çəkiləcək heyvanlar müstəsna olaraq, qalanları sizə halal edildi. Şübhəsiz ki, Allah istədiyini hökm edər!”** (Maidə, 5/1).

O, yenə buyurur: **“Allah kimi düz yola yönəltmək istəsə, onun köksünü islam (dini) üçün açıb genişləndirər, kimi azdırmaq istəsə, onun ürəyini daraldıb sıxıntıya salar. O, sanki (sıxıntının şiddətindən) göyə çıxar...”** (Ənam, 6/125).

O buyurur: **“... yaxşılıq edin! Allah yaxşılıq (ehsan) edənləri sevir”** (Bəqərə, 2/195).

O, yenə buyurur: **“...insafla hərəkət edin. Şübhəsiz ki, Allah insaflıları sevər!”** (Hücurat, 49/9).

O, yenə buyurur: **“...Onlar sizinlə doğru-düzgün davrandıqca siz də onlarla doğru-düzgün dolanın. Həqiqətən, Allah müttəqiləri sevir!”** (Tövbə, 9/7).

O, yenə buyurur: **“...Allah tövbə edənləri və pak olanları sevər!”** (Bəqərə, 2/222).

O, yenə buyurur: **“De: “Əgər siz Allahı sevirsinizsə, mənim ardımca gəlin ki, Allah da sizi sevsin...”** (Ali İmran, 3/31).

O, yenə buyurur: **“...Allah (onun yerinə) elə bir tayfa gətirər ki, (Allah) onları, onlar da (Allahı) sevərlər...”** (Maidə, 5/54).

O, yenə buyurur: **“Şübhəsiz ki, Allah Öz yolunda möhkəm divar kimi səf çəkib döyüşənləri sevər!”** (Saff, 61/4).

O, yenə buyurur: **“Çox bağışlayan, çox sevən də Odur”** (Buruc, 85/14).

O, buyurur: **“Mərhəmətli və Rəhmli Allahın adı ilə!”** (Fatihə, 1).

O, yenə buyurur: **“Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi əhatə etmişdir...”** (Mumin (Ğafir), 40/7).

O, yenə buyurur: **“...Allah möminlərə rəhm edəndir!”** (Əhzab, 33/43).

O, yenə buyurur: **“...Mərhəmətim hər şeyi ehtiva etmişdi...”** (Əraf, 7/156).

O, yenə buyurur: **“...Rəbbiniz Özü-Özünə rəhmli olmağı yazmışdır (bəndələrinə qarşı rəhmli olmağı əzəldən Özü Özü üçün müəyyən etmişdir)...”** (Ənam, 6/54).

O, yenə buyurur: **“...O, bağışlayandır, rəhm edəndir”** (Yunus, 10/107).

O, yenə buyurur: **“...Allah Özü (onu) ən yaxşı qoruyandır və rəhmlilərin ən rəhmlisidir!”** (Yusuf, 12/64).

O buyurur: **“...Allah onlardan, onlar da Allahdan razıdırlar...”** (Maidə, 5/119).

O, yenə buyurur: **“Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir. Allah ona qəzəb və lənət edər...”** (Nisa, 4/93).

O, yenə buyurur: **“Bu da onların Allahın qəzəbinə səbəb olan şeyə uymaları və (Allaha) xoş gedən şeyi bəyənmədiklərinə görədir...”** (Muhəmməd, 47/28).

O, yenə buyurur: **“(Firon əhli) Bizi qəzəbləndirdiyi zaman Biz onlardan intiqam aldıq...”** (Zuxruf, 43/55).

O, yenə buyurur: **“...Lakin onların davranışı Allaha xoş gəlmədi, buna görə də (cihada çıxmaqlarına) mane oldu...”** (Tövbə, 9/46).

O, yenə buyurur: **“Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar”** (Saff, 61/3).

O buyurur: **“Yoxsa onlar Allahın bulud kölgələri içində mələklərlə gəlməsini və işin tamam olmasını (özlərinin məhv edilməsini) gözləyirlər?”** (Bəqərə, 2/210).

O, yenə buyurur: **“(Məkkə müşrikləri) özlərinə yalnız mələklərin, yoxsa Rəbbinin, yaxud da Rəbbinin bəzi qiyamət əlamətlərinin gəlməsinimi gözləyirlər?..”** (Ənam, 6/158).

O, yenə buyurur: **“Xeyr! Yer dağılıb parça-parça olacağı; Rəbbinin gəlib, mələklər səf-səf duracağı zaman...”** (Fəcr, 89/21-22).

O, yenə buyurur: **“Göyün buludla parçalanacağı, mələklərin bölük-bölük (yerə) endiriləcəyi gün...”** (Furqan, 25/25).

O buyurur: **“Ancaq əzəmət və kərəm sahibi olan Rəbbinin Üzü əbədidir”** (Rəhman, 55/27).

O yenə buyurur: **“...Onun Üzündən başqa hər şey məhv olacaqdır...”** (Qəsəs, 28/88).

O yenə buyurur: **“(Allah) dedi: “Ey İblis! Sənə, Mənim iki əlimlə yaratdığıma səcdə etməyə mane olan nə idi?”** (Sad, 38/75).

O yenə buyurur: **“Yəhudilər dedilər: “Allahın əli bağlıdır!” Onların öz əlləri bağlandı və dedikləri sözə görə lənətə gəldilər. Əksinə, Onun hər iki əli açıqdır və O, Öz lütfündən istədiyi kimi sərf edir...”** (Maidə, 5/64).

O buyurur: **“Sən öz Rəbbinin hökmünə səbir et! Həqiqətən, sən Bizim Gözlərimiz önündəsən (himayəmiz altında)...”** (Tur, 52/48).

O yenə buyurur: **“Biz onu taxtalardan pərçimlənib mismarlanmış gəmidə daşıdıq. İnkar edilmiş (peyğəmbərə) mükafat olaraq o *gəmi* Gözlərimiz önündə (himayəmiz altında) üzüb gedirdi”** (Qəmər, 54/13-14).

O yenə buyurur: **“...Gözlərim önündə boya-başa çatdırılasan deyə, Öz tərəfimdən sənə qarşı (qullarım arasında) məhəbbət oyatdım”** (Ta ha, 20/39).

O buyurur: **“Əri barəsində səninlə mübahisə edən və Allaha şikayət edən qadının sözünü Allah eşitdi. Allah sizin söhbətinizi eşidir. Həqiqətən, Allah Eşidəndir, Görəndir”** (Mucadilə, 58/1).

O yenə buyurur: **“Allah kasıbdır, biz isə varlıyıq!” - deyənlərin sözünü Allah eşitdi...”** (Ali-İmran, 3/181).

O yenə buyurur: **“Yoxsa onlar elə hesab edirlər ki, Biz onların sirlərini və gizli danışıqlarını eşitmirik? Xeyr! Yanlarında (əməllərini) yazan elçilərimiz vardır”** (Zuxruf, 43/80).

O buyurur: **“(Allah buyurdu:) “Qorxmayın, Mən sizinləyəm, (hər şeyi) eşidirəm və görürəm!”** (Ta ha, 20/46).

O yenə buyurur: **“Məgər o bilmir ki, Allah görür?”** (Ələq, 96/14).

O yenə buyurur: **“O, səni (namaza) duranda da görür, səcdə edənlər içində hərəkət edəndə də. Həqiqətən də O, Eşidəndir, Biləndir!”** (Şuəra, 26/218-220).

O yenə buyurur: **“De: “İşinizdə olun! Allah, Onun Elçisi və möminlər əməllərinizi görəcəklər...”** (Tövbə, 9/105).

O buyurur: **“...Allahın cəzası şiddətlidir”** (Rəd, 13/13).

O yenə buyurur: **“Onlar hiylə qurdular, Allah da hiylə qurdu. Allah hiylə quranların ən xeyirlisidir”** (Ali-İmran, 3/54).

O yenə buyurur: **“Onlar hiylə qurdular, Biz də hiylə qurduq. Lakin onlar (bunu) hiss etmədilər”** (Nəml, 27/50).

O yenə buyurur: **“Həqiqətən, (kafirlər) hiylə qururlar. Mən də hiylə qururam”** (Tariq, 86/15-16).

O buyurur: **“Əgər bir xeyri aşkara çıxarsanız, yaxud onu gizlətsəniz və ya bir pisliyi bağışlasanız, (bilin ki,) Allah əfv edəndir, (hər şeyə) Qadirdir”** (Nisa, 4/149).[20]

O yenə buyurur: **“...Qoy əfv edib bağışlasınlar. Məgər siz Allahın sizi bağışlamasını istəmirsinizmi? Allah Bağışlayandır, Rəhmlidir”** (Nur, 24/22).

O buyurur: **“...Halbuki qüdrət yalnız Allaha, Onun Elçisinə və möminlərə məxsusdur...”** (Munafiqun, 63/8).

O İblis haqqında da buyurur: **“(İblis) dedi: “Sənin qüdrətinə and olsun ki, onların hamısını yoldan çıxaracağam”** (Sad, 38/82).

O yenə buyurur: **“Sənin əzəmət və kərəm sahibi olan Rəbbinin adı nə qədər mübarəkdir”** (Rəhman, 55/78).

O buyurur: **“...Elə isə yalnız Ona ibadət et və Ona ibadətdə səbirli ol! Heç Ona oxşarını tanıyırsanmı?!”** (Məryəm, 19/65).

O yenə buyurur: **“...Onun heç bir tayı-bərabəri (bənzəri) də yoxdur!”** (İxlas, 112/4).

O yenə buyurur: **“...bilə-bilə (heç kəsi) Allaha tay tutmayın”** (Bəqərə, 2/22).

O yenə buyurur: **“İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini (Ona) tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər...”** (Bəqərə, 2/165).

O yenə buyurur: **“De: “Özünə heç bir övlad götürməyən, mülkündə heç bir şəriki olmayan, aciz qalmamaqdan ötrü (Özünə kömək edəcək) heç bir dosta möhtac olmayan Allaha həmd olsun!” Onu tərifləyərək Uca tut”** (İsra, 17/111).

O yenə buyurur: **“Göylərdə və yerdə olanların hamısı Allahın şəninə təriflər deyir. Hökm Onundur, həmd Ona məxsusdur. O, hər şeyə qadirdir”** (Təğabun, 64/1).

O yenə buyurur: **“Aləmləri** (insanları və cinləri Allahın əzabı ilə) **qorxutmaq üçün** (haqqı batildən ayıran) **Quranı Öz bəndəsinə** (Muhəmmədə) **nazil edən Allah nə qədər** (uca, nə qədər) **uludur!** (Ucalardan ucadır; əzəli və əbədidir, xeyir-bərəkəti bol və daimidir!) **O Allah ki, göylərin və yerin hökmü** (səltənəti) **Onundur. O** (Özünə) **heç bir övlad götürməmişdir; mülkündə heç bir şəriki yoxdur. O, hər**

---

[20] Ibn Useyminin Vasitiyyəyə yazdığı şərhdə Nisa surəsinin 149-cu ayəsi ilə Nur surəsinin 22-ci ayəsi arasında Əhzab surəsinin 54-cü ayəsi yazılıb. (R.H.)

**şeyi yaratmış və onu** (onun nə cür olacağını) **təqdir** (əzəldən müəyyən) **etmişdir".** (Furqan, 25/1-2).

O yenə buyurur: **"Allah** (Özünə) **heç bir övlad götürməmişdir.** (Nə İsa Onun oğlu, nə də mələklər Onun qızlarıdır. Əksinə, onların hamısı Allahın qüdrətindən yaranmış məxluqatlardır). **Onunla yanaşı** (ibadət ediləcək) **heç bir tanrı yoxdur. Əgər belə olsaydı, onda heç bir tanrı əlahiddə öz yaratdıqları ilə gedər,** (öz məxluqatını ayırıb aparar) **və onların bir qismi** (dünyadakı padşahlar kimi) **digərinə üstün olmağa çalışardı. Allah müşriklərin** (Ona) **aid etdikləri sifətlərdən tamamilə kənardır! O, qeybi də, aşkarı da bilir. Allah** (müşriklərin) **Ona qoşduğu şəriklərdən çox ucadır!"** (Muminun, 23/91-92).

O buyurur: **"Heç kəsi Allaha oxşatmayın. Həqiqətən, Allah bilir, siz isə bilmirsiniz"** (Nəhl, 16/74).

O yenə buyurur: **"De: "Rəbbim həm aşkar, həm də gizli (törədilən) yaramaz əməlləri, *hər cür* günahı, haqsızcasına zülm etməyi, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmağınızı və bilmədiyiniz şeyləri Allahın əleyhinə söyləməyinizi haram buyurmuşdur"** (Əraf, 7/33).

O buyurur:

**"Ər-Rəhman Ərşin üzərinə ucaldı"** (Ta ha, 20/5) və **"Sonra da Ərşə ucalan Allahdır"** (Əraf, 7/54).

Allah bu mövzunu Quranda altı dəfə təkrar etmişdir.[21]

O buyurur: **"Doğrudan da, Rəbbiniz göyləri və yeri altı gündə yaradan, sonra da Ərşə ucalan Allah..."** (Əraf, 7/54).

O yenə buyurur: **"Doğrudan da, Rəbbiniz göyləri və yeri altı gündə yaradan, sonra da Ərşə ucalan Allah ..."** (Yunus, 10/3).

O yenə buyurur: **"Gördüyünüz göyləri dirəksiz ucaldan, sonra da Ərşə yüksələn... Allahdır" (**Rəd, 13/2).

O yenə buyurur: **"Ər-Rəhman Ərşə ucaldı"** (Ta ha, 20/5).

O yenə buyurur: **"...sonra da Ərşə ucaldı. Ər-Rəhman..."** (Furqan, 25/59).

O yenə buyurur: **"Allah - göyləri, Yeri və onların arasındakıları altı gündə yaratmış və sonra da Ərşində qərar tutmuşdur"** (Səcdə, 32/4).

O yenə buyurur: **"Göyləri və yeri altı gündə yaradan, sonra da Ərşinə ucalan Odur..."[22]** (Hədid, 57/4 ).

---

[21] Bu ifadə əlyazma və "Fətavalar" əsərində varid olmuşdur. Lakin çap edilmiş şərhlərdə isə aşağıdakı kimidir: "O buyurur: **"Ər-Rəhman Ərşə ucaldı"** (Taha, 20/5). Yeddi dəfə təkrar edilmişdir."

Əgər İbn Teymiyyə məhz Əraf surəsində buyurulan ayənin altı dəfə təkrar edilməsini nəzərdə tutursa, bu doğurdan da belədir. Çünki Ta ha surəsinin 5-ci ayəsindən fərqli olaraq yerdə qalan digər altı ayədəki ifadə tələffüz baxımından eynidir. Yox əgər yeddi yerdə təkrarlanıb ifadəsini əsas götürsək onda bu, ya mənaya, ya da istiva kəliməsinə görə söylənilmişdir. Quranın ərəb orijinalında müqayisə et. Red.

[22] *İstəvə aləl-Ərş* (O, Ərşə ucaldı). Bu, imam Malikin dediyi kimi qəbul edilməlidir:

Onun qərar tutması məlumdur, amma bunun "necəliyi" məlum deyil. Başqa sözlə, Allahın Ərşdə qərar tutması bir fakt kimi, "necə" sualı verilmədən, qəbul olunmalıdır. Yaxşı olar ki, müsəlman öz vaxtını müsəlmanların və bütün bəşəriyyətin vəziyyətinin yaxşılaşdırılmasına həsr etsin, nəinki onu cavabı olmayan mübahisələrdə itirsin. İmanın müəyyən müddəaları var ki, onlara aid suallara cavab təkcə Uca Allaha məlumdur. Ona görə bunu Onun ixtiyarına verək".

O yenə buyurur: **“Ey İsa! Mən səni öldürüb Özümə tərəf qaldıracağam...”** (Ali-İmran, 3/55).

O yenə buyurur: **“Əksinə, Allah onu Özünə tərəf qaldırmışdır”** (Nisa, 4/158).

O yenə buyurur: **“...Gözəl söz Ona tərəf yüksəlir və onu ucaldan yaxşı əməldir...”** (Fatir, 35/10).

O yenə buyurur: **“Firon dedi: “Ey Haman! Mənim üçün bir uca qala tik ki, bəlkə, yollara çatım - göylərin yollarına çatım və Musanın İlahını görüm. Həqiqətən, mən onu yalançı sayıram!”** (Ğafir, 40/36-37).

O yenə buyurur: **“Göydə olanın sizi yerə batırmayacağına əminsinizmi? O zaman yer hərəkətə gəlib titrəyəcəkdir. Ya da ki, göydə Olanın üstünüzə daşlar yağdırmayacağına əminsinizmi? Siz, Mənim xəbərdarlığımın necə nəticələr verdiyini biləcəksiniz”** (Mulk, 67/16-17).

O yenə buyurur: **“Göyləri və yeri altı gündə yaradan, sonra da Ərşinə ucalan Odur. O, yerə girəni də, oradan çıxanı da, göydən enəni də, oraya qalxanı da bilir. Siz harada olsanız belə, O sizinlədir. Allah sizin nə etdiklərinizi görür”** (Hədid, 57/4).

O yenə buyurur: **“...Üç nəfərin arasında gedən elə bir xəlvəti söhbət yoxdur ki, *onların* dördüncüsü, beş nəfərin də altıncısı O olmasın. İstər bundan az, istərsə də çox olsunlar – harada olursa olsunlar, O yenə də onlarladır. Sonra Qiyamət günü onlara nə etdiklərini xəbər verəcəkdir. Allah hər şeyi bilir”** (Mucadilə, 58/7).

O yenə buyurur: **“...Qəm yemə, Allah bizimlədir!...”** (Tovbə, 9/40).

O yenə buyurur: **“...Mən sizinləyəm, eşidirəm və görürəm!”** (Ta ha, 20/46).

O yenə buyurur: **“Həqiqətən də, Allah *Ondan* qorxanlar və yaxşı işlər görənlərlədir”** (Nəhl, 16/128).

O yenə buyurur: **“...Səbr edin, Allah səbr edənlərlədir”** (Ənfal, 8/46).

O yenə buyurur: **“Neçə-neçə az saylı dəstələr Allahın izni ilə çox saylı dəstələrə qalib gəlmişdir!” Allah səbir edənlərlədir”** (Bəqərə, 2/249).

O buyurur: **“...Allahdan daha doğru danışan kim ola bilər?!”** (Nisa,4/87).

O buyurur: **“...Sözündə Allahdan daha doğruçu kim ola bilər?”** (Nisa, 2/122).

O yenə buyurur: **“Allah deyəcəkdir: “Ey Məryəm oğlu İsa!..”** (Maidə, 5/116).

O yenə buyurur: **“Rəbbinin kəlamı doğru (düzgün) və ədalətli şəkildə tamam oldu”** (Ənam, 6/115).

O yenə buyurur: **“...Allah Musa ilə sözlə (arada heç bir başqa vasitə olmadan) danışdı”** (Nisa, 4/164).

O yenə buyurur: **“...Allah onlardan (peyğəmbərlərdən) bəzisi ilə danışmışdır”** (Bəqərə, 2/253).

O yenə buyurur: **“Musa təyin etdiyimiz vaxtda gəldikdə Rəbbi onunla (arada heç bir vasitə olmadan) danışdı...”** (Əraf, 7/143).

O yenə buyurur: **“Biz** (Musanı) **Tur dağının sağ tərəfindən çağırdıq və** (Allahla danışmaq üçün yalvarıb) **gizli dua edərkən özümüzə yaxınlaşdırdıq.”** (Məryəm, 19/52).

O yenə buyurur: **“Bir zaman Rəbbin Musaya belə buyurmuşdu: “Get o zalım tayfanın yanına...”** (Şuəra, 26/10).

O yenə buyurur: **“...Rəbbi onları çağırıb dedi: “Məgər sizə bu ağacı (ağaca yaxınlaşmağı) qadağan etməmişdimmi?”** (Əraf, 7/22).

O yenə buyurur: “(Allah) **həmin gün onlara xitab edib belə buyuracaqdır: “Mənim şəriklərim olduqlarını iddia etdikləriniz** (bütlər, tanrılar) **haradadırlar?!”** (Qəsəs, 28/62).[23]

O yenə buyurur: “(Allah) **həmin gün onları çağırıb belə buyuracaqdır: “Peyğəmbərlərə nə cavab verdiniz?”** (Qəsəs, 28/65).

O yenə buyurur: **“Əgər müşriklərdən biri səndən aman istəsə, ona aman ver ki, Allah kəlamını (Quranı) dinləsin”** (Tovbə, 9/6).

O yenə buyurur: **“...Halbuki (Musa dövründə) onların içərisində elələri vardır ki, Allahın kəlamını (Tövratı) dinləyib anladıqdan sonra, onu bilə-bilə təhrif edirlər”** (Bəqərə, 2/75).

O yenə buyurur: **“...Onlar Allahın sözünü dəyişdirmək istəyirlər. De: “Siz əsla bizim arxamızca gəlməyəcəksiniz. Allah əvvəldən belə buyurmuşdur...”** (Fəth, 48/15).

O yenə buyurur: **“Rəbbinin kitabından sənə vəhy olunanı oxu. Onun sözlərini heç kəs dəyişdirə bilməz...”** (Kəhf, 18/27).

O yenə buyurur: **“Həqiqətən, bu Quran İsrail oğullarına ixtilafda olduqları şeylərin əksəriyyətini anladıb xəbər verir”** (Nəml, 27/76).

O yenə buyurur: **“Nazil etdiyimiz bu Quran mübarək (xeyir-bərəkəti daim, faydası çox) bir kitabdır...”** (Ənam, 6/92).[24]

O yenə buyurur: **“...Əgər Biz bu Quranı bir dağa nazil etsəydik, sən onun Allahın qorxusundan (kiçildiyini) parça-parça olduğunu görərdin...”** (Həşr, 59/21).

O yenə buyurur: “**Biz bir ayənin yerinə digər bir ayəni gətirdikdə Allah nə nazil etdiyini Özü daha yaxşı bilir (kafirlər Muhəmmədə): “Sən ancaq bir iftiraçısan” – deyərlər. Xeyr! Onların əksəriyyəti bilməz! (Ya Rəsulum!) De: “Ruhülqüds (Cəbrail) onu (Quranı) sənin Rəbbindən iman gətirənlərə səbat vermək, müsəlmanları isə doğru yola yönəltmək və (onlara Cənnətlə) müjdə vermək üçün haqq olaraq nazil etmişdir!” Biz (müşriklərin): “(Quranı) ona (Muhəmmədə) bir insan öyrədir!” – dediklərini də bilirik. Onların nəzərdə tutduqları adamın dili başqa dildir. Bu isə açıq-aşkar ərəb dilidir!”** (Nəhl, 16/101-103).

O buyurur: **“O gün neçə-neçə üzlər sevinib güləcək, Öz Rəbbinə baxacaqdır!** (Qiyamə, 75/22-23).

O yenə buyurur: **“...və taxtlar üstündə baxacaqlar...”** (Mutəffifin, 83/35).

---

[23] Bu ayə ərəb orijinalında yox idi. (R,H.)

[24] Ibn Useyminin Vasitiyyəyə yazdığı şərhdə Ənam surəsinin 92-ci ayəsinin əvəzinə Ənam surəsinin 155-ci **“Bu nazil etdiyimiz (Quran) mübarək bir kitabdır...”** ayəsi yazılıb. (R.H.)

O yenə buyurur: **“Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafat gözləyir”** (Yunus, 10/26).

O yenə buyurur: **“Orada onlar üçün istədikləri hər şey vardır. Dərgahımızda isə ondan artığı mövcuddur!”** (Qaf, 50/35).

Quranda bu mövzuya həsr edilmiş çoxlu ayələr vardır. Kim hidayət yolunu axtararaq Quranı cidd-cəhdlə öyrənirsə, haqqın yolu ona aydın olar.

## SÜNNƏDƏ ALLAHIN AD VƏ SİFƏTLƏRİ

Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) Sünnəsi[25] Quranı şərh və izah edir, ona yönəldir və onun mənasını bildirir. Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) öz Qüdrətli və UcaRəbbini vəsf etdiyi və elm adamlarının qəbul etdiyi səhih hədislərə də iman gətirmək vacibdir. Belə hədislərdən, məsələn:

***“Rəbbimiz hər gecənin sonuncu üçdə bir hissəsində dünya səmasına enir və buyurur: “Mənə dua edən kimsə varmı, Mən ona cavab verim. Məndən istəyən***

---

[25] **Sünnə** - Qurandan sonra, müsəlmanların gündəlik işlrində müraciət etməli olduqlari mənbədir. Uca Allah bunu Quranda təsbit edərək buyurur:

**“...Allah sənə Quranı və hikməti nazil edərək bilmədiklərini öyrətdi...”** (Nisa, 4/113). Burada *hikmət* sözü dedikdə *Sünnə* nəzərdə tutulur. O (Əzəmətli və Qüdrətli Allah) buyurur:

**“Ey Rəbbimiz! Onların içərisindən özlərinə elə bir peyğəmbər göndər ki, Sənin ayələrini onlara oxusun, Kitabı və Hikməti onlara öyrətsin, onları təmizləsin! Həqiqətən, Sən yenilməz qüvvət, hikmət sahibisən”** (Bəqərə, 2/129).

Öz elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) zövcələrinə nəsihət verərək, O buyurur:

**“Allahın evlərinizdə oxunan ayələrini və hikməti (Sünnəni) yadda saxlayın...”** (Əhzab, 33/34).

Müdrik Allah buyurur:

**“...Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin...”** (Həşr, 59/7).

Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) demişdir: ***“Mənə Quran və üstəlik ona bərabəri verildi”*** (Əbu Davud). Bütün bunlardan bilmək olur ki, Sünnə hüququ, iman və İslam normalarının təsdiqində, demək olar ki, Quran hüququna bərabərdir, axı Sünnə Quranın izahı, onun ümumi məfhumlarını, Uca Allahın buyurduğu kimi, açıqlayan anlayışlardan ibarətdir:

**“...Sənə də Quranı nazil etdik ki, insanlara onlara göndəriləni (hökmləri, halal-haramı) izah edəsən...”** (Nəhl, 16/44).

Bütün bunları xatırlayaraq, heç kimə haqq Sünnəni, guya onun əsli olmaması bəhanəsi altında, inkar etməyə və təkcə Quranda olanları nəzərə almağa yol verilmir. Əgər bunu bir həqiqət kimi qəbul etsək, onda gərək adamlar namaz qılmasın, çünki namazın hərəkətləri və yerinə yetirilməsi (əs-salət) Quranda verilməmişdir. Eynilə həcc mərasimi, dəstəmaz və hər gün yerinə yetirilən çoxsaylı digər əməllər haqqında da Quranda ümumi ifadələrlə anlayış verilmişdir. Ondan başqa, Sünnəni izah edərkən onu məcazi mənada mübaliğə edib şişirtməməli və fəlsəfəçiliyə cəhd göstərməməliyik. Çünki Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) belə bir niyyəti olmamışdır, əksinə, o *(ona Allahın salavatı və salamı olsun!),* həmişə aydın və sadə dildə danışardı ki, insanlar onu başa düşə bilsinlər və öz dininə düzgün əməl edə bilsinlər. O da bir həqiqətdir ki, Sünnəyə aid edilən bəzi həlqələrə və hədislərə uydurulmuş tarixlər və hekayətlər daxil edilmişdir. Lakin bunlar bizə Həqiqəti görməyə və onu doğru və əsil hədis və hekayətlərdən ibarət olan çoxsaylı toplularda tapmağa mane olmamalıdır. Sünnəni və hədisləri tədqiq edib öyrənmiş və toplamış alimlər - əl-Buxari, Muslim, İbn Macə, ət-Tirmizi, ən-Nəsai və bir çox başqa alimlər onların tərkibini yüz illərlə bundan qabaq bizim üçün seçib təmizləmişlər, Allah onlara Axirət aləmində ən yaxşı mükafatlarıyla əvəzini versin!

***varmı, Mən ona verim. Məndən bağışlanma diləyən kimsə varmı, Mən onu bağışlayım.*** (əl-Buxari və Müslim).

Digər hədis:

***"Həqiqətən, Allah, tövbə etmiş mömin qulunun tövbəsinə, sizlərdən hər hansı birinizin miniyinə olan fərəhindən daha çox fərəhlənir."*** (əl-Buxari və Muslim).

Hədis:

***"Allah, biri-digərini öldürüb sonra hər ikisi Cənnətə girən iki nəfərin halına gülür."***[26] (əl-Buxari və Muslim).

Hədis:

***"Allah bəndələrinin (ibad) ümidsiz olmalarına təəccüblənir, halbuki vəziyyətlərinin pisdən yaxşıya dəyişməsi onlara tamamilə yaxındır; O sizin düşdüyünüz çətinliyə və ümidsizlik içində olmanıza baxır və gülür, çünki bilir ki, sizin sıxıntıdan qurtaracağınız vaxt çox yaxındadır".*** Həsən isnadlı hədisdir.

Hədis: ***"Qiyamət günü, kafirlər Cəhənnəmə atıldıqca O, "yenə də varmı?" deyəcək və bu, Qüdrətli Rəbb Öz ayağını (bəzi rəvayətlərdə: qədəmini) onun üstünə qoyanadək davam edəcəkdir. Bu zaman Cəhənnəm (içində öz əhlinin yerləşəcəyindən əlavə yer qalmayıncaya qədər) yığılaraq deyəcək: "Bəsdir! Bəsdir!"*** (əl-Buxari və Muslim).

Hədis**:**

***"Uca Allah buyurur: "Ey Adəm!" O da cavab verir: "Sənin əmrini gözləyərək qarşında durmuşam!" Onda səs onu çağıracaq: Doğrudan da! Allah sənə əmr edir ki, zürriyyətindən Cəhənnəmə düşəcək bir dəstəni çıxarasan"*** (əl-Buxari və Muslim).

Hədis:

***"Allah sizin hər birinizlə aranızda tərcüməçi olmadan danışacaq"*** (əl-Buxari və Muslim).

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) xəstəni ovsunla müalicə etmək haqqında buyurmuşdur:

***"Ey göydə olan Rəbbimiz Sənin adın ucadır, Sənin Rəhmətin göydə olduğu kimi, hökmün də göydə və yerdədir, Öz rəhmətini yerdə də göstər. Bizim səhvlərimizi və günahlarımızı bağışla. Sən xeyirxahların Rəbbisən, bizə Öz Rəhmətindən mərhəmət, bu ağrımıza şəfa nazil et ki, onunla sağalaq."*** (Bu hədisin isnadı həsəndir. Onu Əbu Davud və başqaları rəvayət etmişlər).

Hədis:

***"Siz mənə etibar etmirsiniz? Mən, göydə olanın (Allahın) etibar etdiyi insanam"*** (Səhih səhihdir. Onu əl-Buxari və Muslim rəvayət etmişdir).

Hədis:

[26] Bu hədisin mənası ondan ibarətdir ki, mömin kafirlə müharibəyə gedir və kafir müsəlmanı öldürür və buna görə də müsəlman həyatını Allah naminə fəda edərək Cənnətə daxil olur, lakin bundan sonra kafir İslamı qəbul edib müsəlman olur, daha sonra o, həqiqi müsəlman kimi ölür və öz növbəsində, Cənnətə daxil olur və beləliklə, həm öldürülən və həm də öldürən – hər ikisi Cənnətə girirlər. Bu, Allahın Öz məxluqların olan Rəhmliliyini, İltifatını, Alicənablığını bizə göstərir.

***“Ərş suyun, Allah isə Ərşin üzərindədir. O sizin nə etdiklərinizi bilir.”*** (Həsən hədisdir. Onu Əbu Davud və b. rəvayət etmişdir).

Hədis:

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) kölə qadından: ***“Allah haradadır?”*** – deyə soruşduqda, o belə cavab vermişdi: “Göydə”. Rasulullah (*ona Allahın salavatı və salamı olsun!*) ondan: ***“Mən kiməm?”*** – deyə soruşduqda isə, o: “Sən, Allahın Elçisisən” – demişdi. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) də buyurmuşdu: ***“Onu azadlığa burax, o mömin qadındır.”*** (Muslim).

Hədis:

“Ən əfzəl iman, harada olsan Allahın səninlə olmasını bilməndir” Həsən hədisdir.

Hədis:

***“Sizlərdən kimsə namaza duranda, nə qarşısına, nə sağ tərəfinə tüpüməsin, çünki Allah sizin qarşısındadır; ancaq sol tərəfə, ya da ayağının altına tüpürsün”*** (əl-Buxari və Muslim).

Hədis:

> ***“Ey Allah! Yeddi göyün və yerin Rəbbi, möhtəşəm Ərşin Rəbbi, bizim və hər şeyin Rəbbi, bitkiləri və çəyirdəyi cücərdən, Tövratı, İncili və Quranı nazil edən; nəfsimin şərindən və ixtiyarı Sənin əlində olan bütün canlıların şərindən Sənə sığınıram; Sən – Əvvəlsən, Səndən əvvəl heç nə olmamışdır. Sən – Sonuncusan, Səndən sonra heç nə olmayacaq. Sən – Zahirsən, Səndən ucada heç nə yoxdur. Sən – Batinsən, Səndən yaxında heç nə yoxdur. Məni borclardan qurtar və kasıblığı məndən uzaqlaşdır”*** (Muslim).

Hədis:

Səhabələr yüksək səslə zikr etdikləri zaman Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) onlara buyurmuşdur:

***“Ey insanlar! Özünüzü ələ alın. Siz eşitməyənə və sizlə olmayana dua etmirsiniz; Əksinə siz Eşidənə, görənə və yaxın olana dua edirsiniz. Həqiqətən, sizin dua etdiyiniz hər birinizə miniyinizin boynundan da yaxındır”.*** (əl-Buxari və Muslim).

Hədis:

Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) buyurmuşdur:

***“Siz Rəbbinizi, ayı bədirləndiyi gecədə gördüyünüz kimi görəcəksiniz; sizə Ona baxmağa heç nə mane olmayacaq; əgər siz günəş çıxmazdan öncə (yəni, sübh) və batmazdan öncə (yəni, ilkindi) qılınan namazlara riayət etməyi bacarsanız, bunu edin”*** (əl-Buxari və Muslim).

Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) öz Rəbbi haqda xəbər verdiyi bu kimi digər hədislərə də iman gətirmək vacibdir.

Nicat tapan firqə, Əhli sünnə və camaat tərəfdarları Allahın Öz Kitabında (yəni, Quranda) xəbər verdiklərinə iman gətirdikləri kimi, bu hədislərə də (Allahın ad və sifətlərini) təhrif və inkar etmədən, necəliyinə varmadan və (məxluqatlara) bənzətmədən iman gətirirlər. İslam ümməti digər ümmətlər arasında orta (haqq) yol tutduğu kimi, Əhli sünnə və camaat tərəfdarları da firqələr arasında orta (haqq) yol tutmuşdur.

Əhli sünnə və camaat tərəfdarları, pak və uca Allahın sifətlərinə iman məsələsində inkarçı Cəhmilər [27] ilə forma verən Müşəbbihlər (Allahı məxluqa bənzədənlər) arasında;

Habelə, Uca Allahın gördüyü işlər barədə Qədərilərlə[28] Cəbrilər[29] arasında;

Həmçinin Allahın verəcəyi əzab məsələsində də Murciyələrlə qədərilərdən olan Vaidiyyə[30] və b. arasında;

Imanın və dinin tərifində Hərurilər[31] və Mötəzilələrlə[32] Murciə və Cəhmilər arasında;

---

[27] *Əl-Cəhmiyyə* (cəhmiyyəçilər) – Bəni Rəsibə qəbiləsinin (mövlası) Cəhm İbn Safvan Əbu Muxrizin ardıcıllarıdır. Bəziləri onu ət-Tirmizi, digərləri isə əs-Səmərqəndi adlandırmışlar, Əməvilər dövrünün sonunda Xorasanda qiyam zamanı "qara bayraqlı adam" adlandırılmış əl-Hariz İbn Surayca qoşulmuşdur və hicri 128-ci ildə (745-746 x.i.) Səlm İbn Əhvaz tərəfindən edam edilmişdir. O, müstəqil mövqe tutur, bir tərəfdən Murciə ilə, onların "iman qəlbin işidir; iddia edən təlimi ilə, digər tərəfdən də Allahın bəşəri sifətlərini inkar edən Mötəzilə ilə razı olaraq, digər tərəfdən də Cəbrin ən güclü müdafiəçilərindən biri idi. Yeganə olaraq o, bir şeyi qəbul edirdi – bu da Allahın Qüdrətli və Yaradan olmasıydı ki, bunu digər yaradılmışlar haqqında iddia etmək olmur. Sonra, o, Cənnətin və Cəhənnəmin əbədiliyini inkar edirdi. Onun ardıcılları ondan sonra Cəhmiyyə adlandırıldılar və hicri V əsrə (x.i. 11 əsrə) qədər Tirmiz ətrafında mövcud olmuşlar, sonra isə Əşari təlimini qəbul etmişlər.

[28] *Əl-Qədəriyyə* (qədərilər) – müsəlman təriqətidir. Qədərilər inanırlar ki, insan özü öz əməllərini yara-dır. Bu isə o deməkdir ki, onlar insanı əməllərinin (xaliq əl-əfal) yaradıcısı sayırlar və beləliklə, Allaha yaradıcılıq üzrə şərik qoşurlar.

[29] *Əı-Cəbriyyə* (cəbərilər) – bu ad qədərilərin iddialarının tam əksini müdafiə və azad iradəni təkzib edən və bunun əsasında insanla ruhsuz təbiət arasında fərq qoymayan müsəlmanlara verilmişdir. Cəbərilər buna görə iddia edirlər ki, insanın hərəkətləri Allahın cəbrinə tabedir. Bu ideyanın ən görkəmli tərəfdarı – Cəhm İbn Səfvan və çoxsaylı digər kiçik təriqətlərdir.

[30] *Əl-Vaidiyyə* tərəfdarları inanırlar ki, Allah Ona itaətə görə mükafatlandırdığı kimi, itaətsizliyə görə də ardıcıl olaraq cəzalandırmalıdır. Buradan, onlara görə, belə çıxır ki, əgər insan böyük günah işlədib, tövbə etmədən öldükdə, Allah onu bağışlamamalıdır. Bu təlim Qurana və Sünnəyə ziddir.

[31] *Əl-Həruriyyə* - bu xəvariclərin bir qoludur, İslamda dini təriqətlərin ən ilkinlərindəndir və əhkamın inkişafı nəzər nöqtəsindən, onun əhəmiyyəti, xilafət nəzəriyyəsinə və imana və ya əməllərə haqq qazandırılmasına aid məsələlərin formalaşdırılmasında xüsusi rol oynayır.

Əl-Xəvaric cərəyanının yaranması:

Siffin yaxınlığında döyüşlər zamanı (37-ci h. Ilinin səfər ayı/657-ci x. ilinin iyulu) anlaşılmazlığı aradan qaldırmaq məqsədilə Muaviyə tərəfindən Əliyə verilən iki münsif hakim seçmək təklifi şiəlik üçün bəhanə oldu. Hakimlər Quran əsasında qərar qəbul etməliydilər. Əlinin qoşununun əksəriyyəti bu təklifi qəbul etməyə hazır olduğu zaman, əsasən Təmim qəbiləsindən olan bir qrup döyüşçü Allahın Kəlamı üzərində bəşər məhkəməsi qurulmasına qarşı qəzəblə etiraz etməyə başladılar. "Hökm təkcə Allaha məxsusdur!" (Lə hukmə illə lil-Ləhi) deyə bərkdən qışqıraraq ordunu tərk etdilər və Kufə şəhərinin yaxınlığındakı Hərurə kəndində yerləşdilər və özlərinə başçı kimi, heç nəyi ilə fərqlənməyən bir sıravi əsgər Abdullah İbn Vahb ər-Rasibi seçdilər. Bu ilk təfriqəçilər özlərini hərurilər və ya əl-Muhakkima adlandırmağa başladılar.

[32] *Əl-Mötəzilə* (mötəzililər) – böyük bir dini cərəyandır. Onun tərəfdarları İslamda mücərrəd əhkamlar nəzəriyyəsi icad ediblər. Mötəzililər o şəxslərdir ki, onlar iman və küfr arasında olan itizal Təlimini (əl-mənzilə beynə əl-mənziləteyn) və yaxud imanla küfr arasında olan bir orta halı qəbul edirlər; bu, həmin cərəyanın əsas təlimidir. Mötəzilə adı Həsən əl-Bəsrinin əhatəsində olan şiəlikdən: onların təlimindən (əl-mənzilə beynə əl-mənziləteyn) uzaqlaşdıqdan sonra törənmişdir, çünki Vəsil İbn Ata və Əmr İbn Ubeydə deyilmişdi ki, əl-Həsənin ətrafından ayrılsınlar və özlərinə ayrıca müstəqil məktəb tapsınlar. Müasir alimlərin (üləmaların) bəziləri hesab edirlər ki, mötəzilə cərəyanı Əli İbn Əbu Talibin dövründə təşəkkül taparaq, bir tərəfdən Əli və digər tərəfdən isə Təlha, əz-Zübeyr və Aişənin arasında gedən

həm də Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) səhabələrinə münasibətdə Rafizilərlə[33] Xəvariclər[34] arasında orta (haqq) yol tutmuşlar.

*Üçüncü Fəsil:*

Bizim, Allaha iman haqqında qeyd etdiyimiz məsələlərə, Allahın göylərin fövqündə Öz Ərşi üzərində olmasına, məxluqlarından ucada (yüksəkdə) olmasına, həmçinin harada olmalarından asılı olmayaraq onlarla birgə olmasına və onların nə etdiklərini bilməsinə iman gətirmək mövzuları da daxildir. Bunları Allah Öz Kitabında xəbər vermiş, Onun elçisindən (*ona Allahın salavatı və salamı olsun!*) bu haqda çoxsaylı hədislər rəvayət edilmiş və ümmətin sələfləri yekdilliklə qəbul etmişdir. Allah bütün bu məsələləri bir ayəyə toplayaraq buyurur:

**“Göyləri və yeri altı gündə xəlq edən, sonra ərşə ucalan Odur. O, yerə girəni də, (yerdən) çıxanı da, göydən enəni də, (göyə) qalxanı da bilir. Siz harada olsanız, O sizinlədir. Allah sizin nə etdiklərinizi görəndir!”** (Hədid, 57/4).

**“O sizinlədir”** ifadəsi Allahın Öz məxluqları ilə qarışmasını bildirmir. Bunu heç ərəb dili də təsdiq etmir. Məsələn, ay – Allahın ən kiçik məxluqatlarından biridir; o, səmada olduğu halda eyni zamanda harada olmasından asılı olmayaraq həm səfərdə olanlarla, həm də qeyriləri ilə bərabərdir. Allahın rübubiyyətinə dəlalət edən Onun Öz Ərşində olması və yaratdıqlarını müşahidə və idarə etməsi, onların nə etdikllərini bilməsi və s. bu kimi ifadələrdir.

Allahın bütün bu dedikləri – Onun Ərşə yüksəlməsi və eyni zamanda bizimlə olması – həqiqətdir. Onların heç bir təhrifə ehtiyacı yoxdur. Lakin onlar, **“*O Göydədir”*** sözünün zahiri mənası “*göylər Onu saxlayır və ya Onun üstündədir*” və s. bu kimi saxta fikirlərdən müdafiə olunmalıdır. Bütün elm və iman sahiblərinin yekdil rəyinə görə belə fikirlər əsassızdır.

Həqiqətən də, **“Onun kürsüsü göyləri və yeri əhatə etmişdir.”** (Bəqərə, 255).

**“Həqiqətən, Allah göyləri və yeri zaval tapmasınlar (məhv olmasınlar, öz mehvərindən çıxmasınlar) deyə, tutub saxlayır.”** (Fatir, 41)

**“Məgər Allahın ... Onun izni olmadan yerə düşə bilməməsi üçün göyü tutub saxladığını görmürsənmi?”** (Həcc, 65)

**“Göyün və yerin Onun əmrində durması... Onun qüdrət əlamətlərindəndir”** (Rum, 30/25).

---

mübarizədə bir qrup müsəlmanın bitərəf qalması siyasi mənşəyə malik olmuşdur. Üçüncü (bitərəf) qrup isə tarixi salnamələrdə mübarizədən çıxanlar kimi təsvir olunmuşdur.

Onların dini təliminin bir hissəsi Quranın məxluq (yaradılmış) olması ilə əlaqədardır. Bu rəy orta əsirlərdə müsəlman ilahiyyatçıları arasında çoxsaylı mübahisə və ziddiyyətlərə səbəb olmuşdur. Onların təliminin ən əsas tərəfdarları Abbasi xəlifəsi Məmun və onun qardaşı əl-Mutəzim, əsas əleyhdarı isə məşhur şəriət alimi Əhməd İbn Hənbəl idi.

[33] *Ər-Rafidə* (rafizilər) – şiələrə verilən adlardan biridir. Əl-Əşari izah edir ki, onlar Əbu Bəkrin və Ömərin xəlifəliyini inkar edənlərdilər.

[34] *Əl-Xəvaric* – Bax: (İzah №.44) *əl-Həruriyyə.*

Allahın bəndələrinə yaxın və dualarına cavab verən olmasına iman gətirmək də həmçinin bu mövzuya aiddir. Allah bu iki məsələni bir ayədə cəm edərək buyurur: **"(Ya Rəsulum!) Bəndələrim Məni səndən soruşduqda söylə ki, Mən (onlara) yaxınam. Dua edib Məni çağıranın duasını qəbul edərəm"** (Bəqərə, 2/186).

Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) buyurur: ***Həqiqətən sizin dua etdiyiniz (Allah) sizə miniyinizin boynundan da yaxındır".***

Quran və Sünnədə Allahın yaxınlığı və (məxluqatları ilə) birgə olması haqqında açıqlananlar Onun ucalığı və yüksəkliyi ilə ziddiyyət təşkil etmir. Həqiqətən heç bir sifətində Onun bənzəri yoxdur. O, yaxınlığı ilə uca və ucalığı ilə yaxındır.

Allaha və Onun Kitablarına[35] imanın bir hissəsi də Quranın yaradılmamasına[36], əksinə onun Allahın nazil etdiyi kəlam olmasına iman gətirməkdən ibarətdir. Quranı O nazil etmişdir və Ona da qayıdacaqdır. Allahın onu danışması həqiqətdir. Onun Muhəmmədə (*ona Allahın salavatı və salamı olsun!*) nazil etdiyi Quran, bir başqasının deyil, məhz Allahın kəlamıdır. Quran haqqında: "O, Allah kəlamının başqası tərəfindən hekayəti və ya ifadəsidir" demək olmaz. Hətta insanların Quranı oxuması və ya kitab səhifələrinə yazması, onu Uca Allahın gerçək Sözü olmaqdan xaric etmir. Çünki nitq, onu nəql edənə deyil, onu ilkin olaraq deyənə mənsubdur. Quranın hərfləri də, mənası da Allahın kəlamıdır. Allahın kəlamı nə məna kəsb etməyən hərflər, nə də hərfləri olmayan mənalar deyildir.

Insanların aydın bir səmada günəşi, bədir gecəsi bədirlənmiş ayı maneəsiz gördükləri kimi, Qiyamət günü möminlərin öz gözləri ilə Allahı görəcəklərinə iman gətirmək, Allaha, Onun kitablarına, mələklərinə elçilərinə iman gətirmk mövzusuna aiddir. Möminlər Allahı, həm Arasatda (Məhşərdə) həm də Cənnətə girdikdən sonra Onun istədiyi şəkildə görəcəklər.

## Üçüncü fəsil

Axirət gününə iman gətirmək dedikdə Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) xəbər verdiyi, ölümdən sonra olacaq hər bir şeyə, qəbir fitnəsinə, orada veriləcək əzaba və nemətlərə iman etmək başa düşülür.

Qəbir fitnəsi dedikdə insanların öz qəbirlərində[37] "Rəbbin kimdir? Dinin nədir? Peyğəmbərin kimdir?" sualları ilə imtahan olunacağı (sorğu-suala tutulacağı) nəzərdə tutulur.

---

[35] Allahın Kitabları – Onun nazil etdiyi Kitablar: Tövrat, İncil və Qurandır.

[36] Burada İbn Teymiyyə Quranın yaradılmış olduğunu iddia edən əl-Mötəziləni nəzərdə tutur.

[37] Müsəlman əqidəsinə görə cənazə basdırıldıqdan sonra iki mələk, birinin adı Münkər, digərinki isə Nəkir, sorğu-sual aparırlar və əgər lazım gələrsə, ölü kişini və ya ölü qadını qəbirdə cəzalandırırlar. Qəbirdə kafirlər də, imanlılar da, günahkarlar və möminlər də sorğu-suala tutulurlar. Onlar öz qəbirlərində düz oturaraq müəyyən suallara cavab verməlidirlər. Mömin dindarlar onlara düzgün cavab

(Uca Allah buyurur:) **"Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə sabitqədəm edər."** (İbrahim, 27). Ona görə də mömin deyəcəkdir: “Rəbbim – Allah, dinim – İslam və Muhəmməd (*ona Allahın salavatı və salamı olsun!*) -Peyğəmbərimdir”.

Dinə şübhə edən (kafir) isə deyəcəkdir: “Həh? həh? - bilmirəm. Eşitmişəm ki, insanlar nə isə deyərdilər, mən də təkrar edərdim”. Sonra onu dəmir çəkiclə vuracaqlar, o da bərkdən bağıracaqdır. Onun səsini insanlardan başqa hər şey eşidəcəkdir. Əgər insan eşitsəydi huşunu itirərdi.

Bu fitnədən (sorğu-sualdan) sonra Qiyamət günü insanların ruhları cəsədlərinə qovuşana qədər kimisinə qəbir nemətləri, kimisinə isə əzabı veriləcəkdir.

Sonra Allahın həm Kitabında və həm də Rəsulu (*ona Allahın salavatı və salamı olsun!*) vasitəsi ilə xəbər verdiyi və bütün müsəlmanların yekdilliklə qəbul etdiyi Qiyamət qopacaqdır. İnsanlar qəbirlərindən çılpaq, ayaqyalın, sünnət olunmamış[38] halda aləmlərin Rəbbinin qarşısında durmaq üçün çıxacaqlar. Günəş onlara yaxınlaşacaq və onlardan tər sel kimi axacaqdır. Sonra tərəzi qurulacaq və insanların əməlləri çəkiləcəkdir.

(Uca Allah buyurur:) **“Məhz tərəziləri ağır gələnlər nicat taparlar. Tərəziləri yüngül gələnlər isə özlərinə ziyan edənlərdir. Onlar Cəhənnəmdə əbədi qalarlar”** (Muminun, 23/102-103).

Hər kəsin əməllərinin yazıldığı səhifələr paylanacaqdır. Onlar bəzilərinin sağ əlinə, digərlərinin isə sol əlinə və ya çiynindən veriləcək. Uca və nöqsansız Allah buyurur:

**“Biz hər bir insanın əməlini öz boynundan asar və qiyamət günü (bütün əməllərini) açıq kitab kimi qarşısına qoyarıq. (Ona belə deyərik: ) “Oxu, kitabını (əməl dəftərini). Bu gün sən haqq-hesab çəkməyə özün-özünə (özün öz əməllərinin şahidi olmağa) kifayətsən!”** (İsra, 17/13-14).

Quran və Sünnədə bəyan edildiyi kimi, Allah insanları haq-hesab edəcəkdir. O, mömin bəndəsini ilə təkbə-tək qalacaq və onun günahlarını xatırladacaqdır.

Kafirlərə gəldikdə isə, onlar xeyir və şər əməlləri ölçülənlər kimi haqq-hesab olunmayacaqdır. Çünki onların xeyir əməlləri yoxdur. Lakin onların (günahkar) əməlləri sayılacaq, hesab ediləcək, bir-bir soruşulacaq və etiraf etdiriləcək.

Qiyamət günü Arasatda (Məhşərdə) Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) hovuzu olacaqdır ki, suyu süddən ağ və baldan şirin, piyalələrin sayı göydəki ulduzların sayı qədər, uzunluğu və eni bir aylıq (yola) bərabərdir. Kim ondan bir dəfə içsə, ondan sonra bir daha susuzluq hiss etməyəcəkdir.

Sirat (körpüsü) Cəhənnəmin üzərindən salınmışdır. Bu körpü Cənnətlə Cəhənnəm arasındadır. Adamlar öz əməllərinə müvafiq olaraq onu keçəcəklər. Bəziləri onu bir göz qırpımında, bəziləri ildırım sürəti ilə, bəziləri külək sürəti ilə, bəziləri cins at sürəti ilə, bəziləri minik dəvəsinin yerişi ilə, bəziləri qaça-qaça, bəziləri

---

verəcək və bundan sonra onlar Qiyamət gününədək dinc buraxılacaqlar. Günahkarları və kafirləri isə, öz növbəsində, qeyri-kafi cavab verəcəklər ki, buna görə mələklər onları amansızlıqla kötəkləyəcəklər.

[38] Sünnət olunmamış dedikdə, insanların ilk dəfə dünyaya gəldikləri şəkildə diriltiləcəkləri nəzərdə tutulur. Bununla əlaqədar Uca Allah buyurur: **“Siz Bizim hüzurumuza ilk dəfə sizi yaratdığımız kimi tək-tənha... gəlmisiniz...”** (Ənam, 6/94).

addım-addım, bəziləri iməkləyə-iməkləyə keçəcək, digərləri isə sürünə-sürünə gələcək və yaxalanıb Cəhənnəmə düşəcəkdir. Körpünün üzərində qarmaqlar var və onlar insanları əməllərinə görə tutacaqlar. Kim Siratı keçsə, Cənnətə daxil olar. Siratı keçənlər Cənnətlə Cəhənnəm arasında Qantarada dayandırılacaqlar ki, öz aralarında bir-birinə haqları ödəndiriləcəkdir. Orada təmizləndikdən sonra onlara Cənnətə girməyə icazə veriləcəkdir.

Cənnətin qapılarının açılmasını istəyən ilk şəxs Muhəmməd (*ona Allahın salavatı və salamı olsun!*) olacaqdır. Ümmətlər arasında isə ilk olaraq Cənnətə girən Onun (*ona Allahın salavatı və salamı olsun!*) ümməti olacaqdır.

Qiyamət günü Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) üç şəfaəti olacaqdır:

Birinci şəfaət: peyğəmbərlər - Adəm, Nuh, İbrahim, Musa və Məryəm oğlu İsa (*onlara salam olsun!*) şəfaət etməkdən boyun qaçırdıqlarından sonra növbə Muhəmməd Peyğəmbərə (*ona Allahın salavatı və salamı olsun!*) çatdıqda, o, məhşərə toplananlara şəfaət edəcəkdir.

Ikinci şəfaət: Cənnətə əlinin Cənnətə daxil olması üçün edəcəyi şəfaətdir. Bu iki şəfaət ancaq ona məxsusdur.

Üçüncü şəfaət isə Cəhənnəmə atılmağa layiq olanlar üçün olacaqdır. Şəfaətin bu növü Peyğəmbərimizə (*ona Allahın salavatı və salamı olsun!*) və eləcə də digər peyğəmbərlərə, həmçinin siddiqlərə və başqalarına aiddir. Onlar bəzi Cəhənnəmə atılmağa layiq olan kəslərin oraya düşməməsi üçün, həmçinin Cəhənnəmə atılmış bəzi insanların oradan çıxarılması üçün şəfaət edəcəklər. Həmçinin Uca Allah Öz lütfü və rəhmətiylə bir çox adamları Cəhənnəmdən şəfaətsiz çıxaracaqdır. Dünya əhlindən Cənnətə daxil olacaqlar daxil olduqdan sonra orada boş yerlər qalacaqdır. Buna görə, Allah Cənnət üçün insanlar yaradacaq, sonra onları Cənnətə daxil edəcəkdir.

Axirət həyatında olacaq şeylər: haq-hesab, mükafat, cəza, Cənnət, Cəhənnəm və s. bunlar hamısı səmadan nazil edilmiş (səmavi) kitablarda, peyğəmbərlərdən rəvayət edilmiş və Muhəmmədən (*ona Allahın salavatı və salamı olsun!*) miras qalmış biliklərdə müfəssəl surətdə və kifayət edəcək qədər öz əksini tapmışdır. Hər kim (öyrənmək) istəsə bunu açıq-aşkar görə bilərlər.

Nicat tapmış firqə - Sünnə və camaat əhli Qədərin xeyrinə və şərinə iman gətirir. Qədərə iman iki dərəcədən, hər bir dərəcənin özü isə iki hissədən ibarətdir.

Birinci dərəcə - Uca Allahın elmi ilə məxluqatları əhatə etməsinə və onların da Allahın qədim elminə uyğun olaraq hərəkət (əməl) etmələrinə iman gətirməkdir. O, əzəli və əbədi olaraq bu sifətlərlə vəsf olunmuşdur. O bütün yaratdıqlarının itaətkar və ya asi olacağını, onların ruzilərinin miqdarını və nə zaman öləcəklərini bilir. Sonra Allah Lövhi məhfuzda məxluqatların qədərini yazmışdır.

***“Allah öncə qələmi yaratmış, sonra ona buyurmuşdur: "Yaz!" Qələm soruşmuşdur: nə yazım? Allah buyurmuşdur: “Qiyamət gününə qədər nə baş verəcəyini yaz!” İnsanın başına gələcəklər heç vaxt ondan yan keçməyəcək və ondan yan keçəcəklər isə, heç vaxt ona toxunmayacaqdır. Qələmlər (mürəkkəb) qurumuş və səhifələr isə bükülmüşdür."*** Uca Allah buyurur:

**“(Ya Rəsulum!) Məgər bilmirsənmi ki, Allah göydə və yerdə nə varsa (hamısını) bilir? Həqiqətən, bu, (Lövhi-məhfuzdadir) Kitabdadır. Şübhəsiz ki, bu Allah üçün asandır!”** (Həcc, 22/70).

O yenə buyurur:

**“Yer üzündə baş verən və sizin öz başınıza gələn elə bir müsibət yoxdur ki, Biz onu yaratmamışdan əvvəl o, bir kitabda (lövhi-məhfuzda) yazılmamış olsun. Bu, Allah üçün çox asandır!”** (Hədid, 57/22).

Qədərin bu növü Allaha Öz elmi ilə məlumdur. O (yəni, bu elm), bəzən ümumi, bəzən də müfəssəldir. Allah Lövhi məhfuzda istədiyini yazmışdır: O, ana bətnindəki uşağı yaratdıqda, ona ruh verməmişdən əvvəl, onun yanına mələk göndərir və ona dörd kəliməni: yəni, ruzisini, əcəlini, əməlini, xoşbəxt və ya bədbəxt olacağını yazmağı əmr edir. Keçmişdə qədərin bu növünü Qədərilərin ifrata varan tərəfdarları inkar edirdilər. Zəmanəmizdə isə bunun inkar edən çox azdır.

İkinci dərəcə isə Allahın həyata keçən istəyinə (iradəsinə) və hər şeyi əhatə edən qüdrətinə iman gətirməkdir. Bu, Allahın istədiyinin baş verib, istəmədiyinin isə həyata keçmədiyinə iman gətirməkdir. Şübhəsiz ki, göylərdə və yerdə baş verən hərəkət və ya sükunət yalnız nöqsansız Allahın istəyi və iradəsilədir. Onun səltənətində istəmədiyi bir şey baş verməz. Mövcud olan və mövcud olmayan hər nə varsa Allah ona qadirdir.

Nə yerdə və nə də göylərdə elə bir varlıq yoxdur ki, onun Allahdan başqa yaradıcısı olsun. Ondan başqa yaradan və Ondan başqa Rəbb yoxdur.

Bütün bunlarla yanaşı O, xəlq etdiyi varlıqlarına Özünə və elçilərinə itaət etmələrini əmr etmiş, asi olmağı isə qadağan etmişdir.

Allah müttəqiləri, mühsinləri (əməli salehləri), ədalətliləri sevir və iman gətirənlərdən, yaxşı işlər görənlərdən razıdır.

Allah kafirləri sevmir, fasiq insanlardan da razı deyildir. O, fahiş işləri (əxlaqsızlığı) buyurmur. Bəndələrinə küfrü arzulamır və fəsadı sevmir.

Bəndələr öz əməllərinin həqiqi icraçısı, Allah isə onların əməllərinin xaliqidir. Mömin də, kafir də, saleh də, pis əməl sahibi də, namaz qılan da, oruc tutan da bəndədir. Bəndə öz əməllərini qüdrəti və iradəsi ilə edir. Lakin Allah onun da, onun qüdrətinin də, iradəsinin də yaradıcısıdır. Uca Allah buyurur:

**“Eləcə də sizdən doğru yolda olmaq istəyənlər doğru yolla da gedirlər. Lakin aləmlərin Rəbbi olan Allah istəməsə, siz istəyə bilməzsiniz!”** (Təkvir, 81/28-29).

Qədərin bu dərəcəsini, Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) **"Bu ümmətin məcusiləri"** adlandırdığı qədərilərin əksəryəti inkar edilir. Bu məsələni təsdiq edənlərdən bəziləri (yəni, Cəbrilər təriqəti) isə ifrata vararaq insanın gücü və ixtiyarı (seçimi) olmadığını iddia edirlər. Bu da Allahın etdiyi əməllərin və verdiyi hökmlərin hikmətsiz və faydasız olması mənasını verir.

Əhli sünnə və camaat tərəfdarlarının əsas prinsiplərinə görə din və iman, söz və əməldir; söz dedikdə: qəlbin və dilin sözü, əməl dedikdə: qəlblə, dillə və bədən üzvləri ilə əməl nəzərdə tutulur. Iman itaət göstərməklə artır və asilik etməklə azalır.

Buna baxmayaraq, onlar (sünnə əhli) xəvariclərdən fərqli olaraq, Qiblə əhlini (müsəlmanları) etdikləri asiliklərə və böyük günahlara görə kafir sayılmırlar. Əksinə, etdikləri günahlara baxmayaraq, onlarla iman qardaşlığı sabitdir. Uca Allah buyurur:

**“... (Öldürülən şəxsin) qardaşı (varisi) tərəfindən (müəyyən bir şey, qanbahası müqabilində) bağışlanmış (qatil) ilə adətə görə (yaxşı) rəftar edilməlidir.”** (Bəqərə, 2/178).

O, buyurur:

**“Əgər möminlərdən iki dəstə bir-biri ilə vuruşsa, onları dərhal barışdırın. Əgər onlardan biri təcavüzkarlıq etsə, təcavüzkarlıq edənlə Allahın əmrinə (itaətinə) qayıdana qədər vuruşun.** (Təcavüzkarlıq edən Allahın əmrinə) **qayıtsa, hər iki dəstənin arasını ədalətlə düzəldin və insafla hərəkət edin. Şübhəsiz ki, Allah insaflıları sevər! Həqiqətən, möminlər (dində) qardaşdırlar. Buna görə də iki qardaşınızın arasını düzəldin!..”** (Hucurat, 49/9-10).

Həmçinin onlar (sünnə əhli) Mötəzililərdən fərqli olaraq, müsəlmanlardan fasiqlik edənin tamamiylə imansız olduğunu (dindən çıxdığını) və əbədi olaraq Cəhənnəmdə qalacağını söyləmirlər. Əksinə, (onlar etiqad edirlər ki,) fasiqlər də iman dairəsinə daxildirlər. Uca Allahın buyurur:

**“...mömin bir qul azad etməlidir”** (Nisa, 4/92).

Həmçinin o, mütləq (kamil) iman dairəsinə daxil deyildir. Uca Allahın buyurur:

**“Möminlər yalnız o kəslərdir ki, Allahın adı çəkiləndə ürəkləri qorxudan titrəyər, Allahın ayələri oxunduğu zaman onların imanları daha da artar, onlar ancaq öz Rəbbinə təvəkkül edər”** (Ənfal, 8/2).

Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) də belə demişdir:

***“Zinakar zina etdiyi zaman (kamil imanlı) mömin deyil, oğru öğurluq etdiyi zaman (kamil imanlı) mömin deyil, sərxoş içki içdiyi zaman (kamil imanlı) mömin deyil, insanların gözü önündə olan şərəfli kəs başqalarının malını zorakılıqla əllərindən aldığı zaman (kamil imanlı) mömin deyil.”*** (Əl-Buxari və Müslim).

Onlar (sünnə əhli) beləsi haqqında deyir: O, naqis imanlı mömindir və yaxud imanına görə mömin və böyük günahına görə fasiqdir. Buna görə də, ona nə mütləq (kamil) iman sahibi, nə də tamamiylə imansız deyilmir.

Sünnə və camaat əhlinin əsas prinsiplərindən biri də - Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) səhabələrinə qarşı Allahın onları vəsf etdiyi kimi qəlbi və dili təmiz olmaqdır:

**“Onlardan (mühacirlərdən və ənsarlardan) sonra gələnlər deyirlər: “Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş qardaşlarımızı bağışla. Bizim qəlbimizdə iman gətirənlərə qarşı nifrət və həsədə yer vermə. Ey Rəbbimiz! Həqiqətən də, Sən Şəfqətlisən, Rəhmlisən!”** (Həşr, 59/10).

Həmçinin Allahın Elçisinin (ona Allahın salavatı və salamı olsun) aşağıdakı buyuruğuna itaət edərlər:

***“Mənim səhabələrimi söyməyin. Canım əlində olana and olsun! Sizlərdən kimsə (Allah yolunda) Uhud (dağı) qədər qalaqlanmış qızıl xərcləsə də, onların hər hansı birinin xərclədiyi bir ovuc və ya onun yarısı ilə belə müqayisəyə gəlməz”*** (Əl-Buxari, Müslim, Əbu Davud, Ət-Tirmizi, İbn Macə, Əhməd).

Sünnə əhli Quran, Sünnə və müsəlmanların yekdilliyi rəyi ilə səhabələrin fəziləti və yüksək məqamları (dərəcələri) haqqında sabit olan bütün xəbərləri qəbul edir.

Həmçinin onlar fəthdən[39] yəni, Hudeybiyyə sülhündən[40] öncə (öz malını Allah yolunda) xərcləyənləri və döyüşənləri bundan sonra xərcləyənlərdən və döyüşənlərdən, Mühacirləri də Ənsarlardan üstün tuturlar. Iman gətirirlər ki, uca Allah sayları üç yüz ondan çox olan Bədr döyüşçülərinə buyurmuşdur: "Nə istəyirsinizsə edin. Artıq Mən sizi bağışlamışam."

Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) xəbər verdiyi kimi, ağac altında ona biyət edənlərdən heç kəs Cəhənnəmə girməz. Allah onlardan razı idi, onlar da Allahdan razı idilər. Həmin səhabələrin sayı min dördyüz nəfərdən çox idi.

Sünnə əhli on müjdələnmiş şəxsin[41], həmçinin Sabit ibn Qeys ibn Şəmməsin və s. bu kimi Peyğəmbərin (ona Allahın salavatı və salamı olsun) Cənnətlə müjdələdiyi səhabələrin Cənnətlik olacaqlarına şəhadət verir.

Onlar, möminlərin əmiri Əli ibn Əbu Talibdən **(*Allah ondan razı olsun!*)** və başqalarından nəql edilən çoxsaylı rəvayətlərə əsasən bu ümmətin peyğəmbərindən sonra ən xeyirli adamlarının – Əbu Bəkr, sonra Ömər, üçüncüsü Osman və dördüncüsü Əli (***Allah onların hamısından razı olsun***) olmasını təsdiq edirlər. Səhabələr yekdilliklə biyət (yəni, xəlifə seçimi) məsələsində Osmanı Əlidən önə çəkmişlər. Buna baxmayaraq, Sünnə əhlindən bəziləri Əbu Bəkr və Ömərdən sonra Osmanın yoxsa Əlinin (***Allah onlardan razı olsun!***) daha fəzilətli olmasında ixtilaf etmişdir. Bəziləri üstünlüyü Osmana verərək susmuş və ya Əlini dördüncü saymışlar. Digərləri isə üstünlüyü Əliyə vermişlər. Bir başqaları da bitərəf mövqe tutmuşlar.

---

[39] Bəziləri hesab edirlər ki, qələbə (əl-Fəth) - Məkkənin azad edilməsidir. (*Təfsir İbn Kəsir,* VIII*,* sıh. 37-39, onun "Əl-Hədid" (57) surəsinin 10-cu *ayəsinə* şərhinə bax.).

[40] Xristian tarixi ilə 628-ci ildə Allahın Elçisi (ona Allahın salavatı və salamı olsun) bir qrup müsəlmanı ümrə ziyarəti etmək üçün Məkkəyə aparmışdı, lakin Məkkənin bütpərəstləri çoxsaylı qoşun yığaraq Məkkədən doqquz mil aralıda yerləşən Xudeybiyyə adlı bir yerdə yolu kəsərək ona və səhabələrinə Məkkəyə daxil olmağa mane olmuşdular. Nəticədə az qalmışdı ki, iki qrup arasında az qalmışdı ki, müharibə başlasın, amma bunu əvəzində danışıqlar aparıldı. Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) danışıalarda öz nümayəndəsi kimi Osmanı **(*Allah ondan razı olsun!*)** Məkkəyə göndərdi, lakin o, üç gün geri qayıtmadı və Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) və onun silahdaşlarına xəbər çatdı ki, "Osman məkkəlilər tərəfindən öldürülmüşdür. Allahın Elçisi (*ona Allahın salavatı və salamı olsun!*) məkkəliləri onların xəyanətinə görə cəzalandırmadan Məkkəni tərk edə bilməzdi, hərçənd müsəlmanlar döyüşə hazırlaşmamışdılar. Buna görə də o (*ona Allahın salavatı və salamı olsun!*) öz ardıcıllarını topladı və bir böyük ağacın altında ayaq üstə onlar məkkəlilərlə mübarizədə ona (*ona Allahın salavatı və salamı olsun!*) sədaqətli qalacaqlarına and içdilər (biət etdilər). Bundan sonra Allah onları Quranda təriflədi:

**"...sənə beyət edənlər, şübhəsiz ki, Allaha beyət etmiş olurlar. Allahın (qüdrət) əli onların əllərinin üstündədir..."** (Fəth, 48/10).

Bu surədəcə, 18-ci ayədə Allah Onun Elçisinə (*ona Allahın salavatı və salamı olsun!*) Hudeybiyyədə ağac altında sədaqət andı içən möminlərdən razı qaldığını bildirir və belə buyurur:

**"And olsun ki, ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı bildi, onlara arxayınlıq göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı".**

[41] Bunlar: Əbu Bəkr, Ömər, Osman, Əli, Təlha, əz-Zübeyr, Səd ibn Əbu Vaqqas, Səid ibn Zeyd, Abdurrəhman ibn Auf və Əbu Ubeyda ibn əl-Cərrah idi.

Lakin Sünnə əhli tərəfdarları öncə Osmanın sonra isə Əlininin (əfzəl) olmasına qərar vermişlər. Baxmayaraq ki, bu, yəni, Osman və Əlinin birinciliyi məsələsi Sünnə əhlinin əksər alimlərinə görə dinin əsas prinsiplərindən deyil. Ona görə də ixtilaf edən hər hansı tərəf zəlalətə düşmüş hesab olunmur. Lakin xilafət məsələsində (ardıcıllığa) müxalif olan kəs zəlalətə düşmüş sayıllır. Sünnə əhlinin etiqadına görə Allahın Elçisindən (*ona Allahın salavatı və salamı olsun!*) sonra xəlifə - Əbu Bəkr; sonra Ömər; ondan sonra Osman, sonra da Əlidir. Kim onlardan hər hansı birinin xəlifəliyinə tənə (etiraz) edərsə, uzunqulaqdan da çox yanılmış olar.

Sünnə əhli Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) əhlibeytini (ailəsini) sevir, onları özlərinə dost tutur və Allahın Elçisinin (*ona Allahın salavatı və salamı olsun!*) Qədirxum günündə onlar barəsində söylədiyi vəsiyyətinə riayət edirlər. O buyurmuşdur:

***“Əhlibeytimlə davranışınızda Allahı (Onun rəhmətini və əzabını) xatırlamağınızı tövsiyyə edirəm”.***[42]

Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*), Qureyşdən olan bəzi adamların bəni Haşim qəbiləsinə qarşı sərt rəftar etmələri barəsində şikayət edən əmisi Abbasa belə buyurmuşdur:

***“Nəfsim əlində olana (Allaha) and olsun ki, onlar sizi Allah üçün və mənimlə qohum olduğunuz üçün sevməyincə iman sahibi olmazlar”***[43]

O həmçinin buyurmuşdur:

***“Həqiqətən, Allah İsmayıl oğullarını (digərləri arasından) seçmişdir. Sonra İsmayıl oğulları arasından Kinanə tayfasını, Kinanə tayfasından da Qureyşi, Qureyşdən isə bəni Haşimi, bəni Haşimdən də məni seçmişdir”.***[44]

(Sünnə əhli) Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) zövcələrinə - möminlərin analarına hörmət edir və iman edirlər ki, onlar axirətdə də Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) zövcələri olacaqlar. Onun (*ona Allahın salavatı və salamı olsun!*) əksər övladlarının anası, ona ilk iman gətirən və işlərində onu müdafiə edən Xədicənin (Allah ondan razı olsun!) qadınlar arasında Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) tərəfindən yüksək qiymətləndirilən özünəməxsus yeri vardır.

Həmçinin Siddiqə bint Siddiqə (yəni, Əbubəkrin qızı Aişə, Allah ondan razı olsun!) haqqında Peyğəmbər (ona Allahın salavatı və salamı olsun) buyurmuşdu: ***“Aişənin başqa qadınlardan üstünlüyü Səridin (yəni, əla yemək növünün) digər yeməklərdən üstün olduğu kimidir”***.

(Sünnə əhli) səhabələrə nifrət bəsləyən və onları təhqir edən Rafizilərin, həmçinin Əhli beytə söz və ya əməllə əziyyət verən Nəsibilərin (Xəvariclərin)[45] yolundan çəkinirlər.

Sünnə əhli səhabələrin aralarında baş verən hadisələr (yəni, kimin haqlı kimin haqsız olduğu) barədə danışmır, əksinə bu haqda deyirlər: Onların səhvləri haqqında

---

[42] Muslim

[43] Hədisdə “iman gətirməzsiniz” sözləri “kamil iman gətirməzsiniz” kimi başa düsülməlidir. Əhməd İbn Hənbəl və b. rəvayət etmişdir.

[44] Muslim və Əhməd rəvayət etmişlər.

[45] *Nəvasib* – Əlini və onun ailəsini xoşlamayan bir qrup insanlardır.

varid olan rəvayətlərin bir qismi yalandır, başqa bir qismi də əlavələrə və ya ixtisarlara yaxud da təhrifə məruz qalmışdır. Bu rəvayətlərin gerçək (səhih) olan qismində qeyd olunan hadisələrdə isə onlar, etdikləri ictihadın doğru və ya xəta olmasından asılı olmayaraq müctəhid olduqlarına görə üzürlüdürlər.

Bununla yanaşı Əhli sünnə heç bir səhabəni böyük və ya kiçik günahlardan azad (məsum) hesab etmir. Əksinə onlar da günah edə bilərlər. Lakin buna baxmayaraq, onların etdikləri günahlarını bağışlayacaq, əgər ediblərsə, İslamda öncüllükləri və fəzilətləri vardır. Hətta onlara özlərindən sonra gələnlərə bağışlanmayan günahlar belə bağışlanmışdır. Çünki onların, özlərindən sonra gələnlərin edə bilmədiyi, günahları silən çoxlu savab əməlləri vardır. Onların bütün nəsillərin ən xeyirliləri olması, hər hansı birinin verdiyi bir ovuc sədəqənin, onlardan sonra gələnlərin verdikləri Uhud dağı boyda qızıldan daha üstün sayılması Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) kəlamlarında öz təsdiqini tapmışdır.[46]

Bundan başqa, əgər onlardan kimsə hər hansı bir günah edibsə, ola bilsin ki, o bu günahı üçün tövbə etmiş, yaxud günahını siləcək savab işlər görmüş, ya da İslamı ilk qəbul edənlərdən olduğuna görə və ya Muhəmmədin (*ona Allahın salavatı və salamı olsun!*) şəfaəti ilə bağışlanmışdır. Beləki, səhabələr Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) şəfaətinə ən layiq insanlardır. Yaxud da bu dünyada məruz qaldığı hər hansı bir bəla onun günahına kəffarə olmuşdur. Əgər onların gerçək günahlara görə bu qədər üzr qazandırmaq mümkündürsə, bəs elə isə ictihad etdikləri məsələlərə nə demək olar? Əgər ictihadları doğru olarsa iki, yox əgər səhv olarsa bir savab qazanarlar. Səhv isə bağışlanar.

Daha sonra, onların bəzilərinin etdikləri xoşagəlməz əməllər, Allaha və Onun elçisinə iman, Allah yolunda cihad, hicrət, köməklik etmək, faydalı elm, saleh əməllər və s. bu kimi üstünlükləri və yaxşılıqları ilə müqayisədə çox cüzidir. Kim səhabələrin həyatına və Allahın onlara bəxş etdiyi fəzilətlərə elm və bəsirət gözü ilə nəzər salarsa, onların Peyğəmbərlərdən sonra ən xeyirli insanlar olduğunu yəqinliklə bilər və görər ki, nə onlardan öncə, nə də onlardan sonra belə insanlar olmamışdır. Həqiqətən onlar, bütün ümmətlərin ən xeyirlisi və Allah yanında ən üstünü olan bu ümmətin seçilmiş nəslidirlər.

Əhli sünnə və camaat tərəfdarlarının əsas prinsiplərindən biri də – övliyaların kəramətlərinin: müxtəlif elmi sahələrdə, (gizli və çətin olan) bir şeyi üzə çıxarmaqda, istedad və təsiretmə bacarıqlarında və s. Allahın övliyalarına verdiyi fövqəltəbii hərəkətlərin təsdiq edilməsidir. Məsələn, "Kəhf" və digər surələrdə keçmiş ümmətlərin kəramətləri qeyd olunmuşdur. Həmçinin bu ümmətin ilk nəsllərinin - səhabə və tabiinlərin və ümmətin digər nəsillərinin kəramətləri olmuş və Qiyamət gününə qədər olacaqdır.

Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) yolunu, həmçinin ilk müsəlmanlardan sayılan mühacir və ənsarların yolunu davam etdirmək Əhli sünnə və camaat tərəfdarlarının prinsiplərindən biridir. Eyni zamanda onlar Peyğəmbərin (*ona*

---

[46] Əl-Buxari və Muslim

*Allahın salavatı və salamı olsun!*) aşağıdakı tövsiyəsinə riayət edirlər. O buyurmuşdur:

***“Sizə sünnəmi və məndən sonra doğru yolu göstərən raşidi xəlifələrin yolunu tövsiyyə edirəm. Ondan azı dişlərinizlə yapışın. Dində yeniliklərdən (bidətlərdər) çəkinin. Çünki hər bir bidət zəlalətdir.”***[47]

Sünnə əhli bilir ki, ən doğru söz – Allahın kəlamı və ən xeyirli hidayət yolu isə Muhəmmədin (*ona Allahın salavatı və salamı olsun!*) hidayət yoludur. Onlar Allahın kəlamını bütün insanların kəlamından və Muhəmmədin (*ona Allahın salavatı və salamı olsun!*) hidayət yolunu hər bir kəsin yolundan üstün tuturlar. Buna görə də onlar bəzən Kitab və Sünnə tərəfdarları, bəzən də Camaat tərəfdarları adlandırılırlar. Camaat dedikdə birlik qəsd olunur. Onun əksi isə təfriqəçilikdir. Baxmayaraq ki, həmin toplumun özü də “Camaat” adı ilə çağırılır.

Elmdə və dində üçüncü əsas yekdil rəydir (ərəb. icma).

Əhli sünnə tərəfdarlarına görə bu üç əsas (yəni, Quran, Sünnə və icma), insanların dinə aid olan gizli və aşkar dedikləri söz və etdikləri əməllərinin meyarıdır. Düzgün sayılan yekdil rəy (yəni, icma) saleh sələflərin birgə söylədikləri rəydir. Çünki onlardan sonra ümmət arasında ixtilaflar artmış və yayılmışdır.

Sünnə əhli bu əsas prinsiplərə riayət etməklə yanaşı, şəriətin buyurduğu şəkildə yaxşı işləri tövsiyə edir və pis işlərdən çəkindirirlər. Onlar, rəiyyəti ilə yaxşı və ya pis davranan rəhbərlərlə birlikdə həccin yerinə yetirilməsini, cihad edilməsini, cümə və bayram namazlarının qılınmasını düzgün hesab edirlər. Camaatla birgə qılınan namazlarda iştirak edirlər. Həmçinin ümmətin hər bir fərdinə nəsihət verməyi dinə uyğun bir əməl hesab edirlər. Onlar Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) aşağıdakı hədislərinin bu mənanı daşıdığını etiqad edirlər. Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) barmaqlarını bir-birinə keçirərək buyurmuşdur: ***“Bir mömin digər mömin üçün möhkəm tikili kimidir. Onlar bir-birilərinə bağlanarlar”.***[48]

Digər hədisdə buyurur: ***“Möminlərin bir-birinə məhəbbəti, mərhəməti və rəftarı bir cəsədə bənzəyir. Onun hər hansı bir üzvü ağrıyarsa, digər üzvüləri də qızdırma və yuxusuzluqla ona şərik olarlar (yəni, bütün cəsəd əzyyət çəkər).”***[49]

Əhli sünnə tərəfdarları insanlara bədbəxtlik üz verdiyi zaman səbirli olmağı, rahatlıq zamanı şükr etməyi və qəzavü-qədərin acısına razı qalmağı tövsiyyə edirlər. Onlar insanları gözəl əxlaqı mənimsəməyə və xeyirxah əməllərə sövq edirlər. Onlar Peyğəmbərin (*ona Allahın salavatı və salamı olsun!*) aşağıdakı hədisinin bu mənanı daşıdığını etiqad edirlər. O, buyurmuşdur:

***“Möminlərin ən kamil imanlısı gözəl əxlaqı olan kəsdır”.***[50]

Əhli sünnə tərəfdarları ünsiyəti kəsənlə əlaqəni bərpa etməyə, qadağan edənə əta etməyə, zülm edənləri bağışlamağa sövq edir. Həmçinin valideyinlərə yaxşılıq etməyi və qohumluq əlaqələrini saxlamağı, qonşulara qarşı xeyirxah olmağı,

---

[47] Hədisi Əhməd ibn Hənbəl, Əbu Davud, İbn Macə və ət-Tirmizi rəvayət edilmiş və Ət-Tirmizi hədisin yaxşı hədis olduğunu demişdir.

[48] əl-Buxari və Muslim rəvayət etmişdir.

[49] əl-Buxari və Muslim rəvayət etmişdir.

[50] Əhməd və ət-Tirmizi rəvayət etmişdir. ət-Tirmizi hədisin həsən olduğunu bildirmişdir.

yetimlərə, kasıblara, müsafirlərə əl tutmağı, kölələrlə yumşaq davranmağı buyururlar. Onlar lovğalığı, təkəbbürlüyü, həddini aşmağı, haqlı və ya haqsız yerə özünü başqalarından üstün tutmağı qadağan edirlər. Onlar yüksək əxlaqi keyfiyyətləri əmr edərək yaramaz əməllərə son qoyulmasını tələb edirlər.

Əhli sünnənin burada və ya digər yerdə dediyi sözlər və etdiyi əməllər, Quran və Sünnədən qaynaqlanmışdır. Onların yolu, Allahın Muhəmmədlə (*ona Allahın salavatı və salamı olsun!*) göndərdiyi İslam dinidir.

Lakin Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) xəbər vermişdir ki:

***"Onun ümməti yetmiş üş firqəyə bölünəcək və onların birindən başqa, hamısı Cəhənnəmə düşəcəkdir. Həmin firqə camaat tərəfdarlarıdır."***[51]

Başqa bir hədisdə isə o, buyurur:

***"Onlar (yəni, nicat firqəsi) mənim və səhabələrimin bu gün getdiyi yolla gedən şəxslərdir"***[52]

Deməli, təhriflərdən uzaq olan pak İslam dinindən yapışanlar məhz Əhli sünnə və camaat tərəfdarlarıdır.

Onların arasında siddiqlər, şəhidlər, əməlisalehlər, haqq bələdçiləri, gecələrin nurları, yaddaşlardan silinməz xidmət və unudulmaz fəzilət sahibləri, zahidlər, həmçinin bütün müsəlmanların hidayət və elmlərinə şəhadət verdiyi imamlar vardır.

Onlar kömək olunan tayfadır (ərəb. taifətul-mənsura). Peyğəmbər (*ona Allahın salavatı və salamı olsun!*) onların barəsində buyurmuşdur:

***"Mənim ümmətimdən haqq işlərindəköməklik göstərilən bir tayfa Qiyamət Gününədək olacaq. Onlara müxalif olanlar və ya onları rəzil etmək istəyənlər buna müvəffəq ola bilməyəcəklər. "***[53]

Allahdan diləyirik ki, bizi onların sırasında etsin, hidayət etdikdən sonra qəlbimizi haqq yolundan azmağa qoymasın və bizə Öz rəhmətindən bəxş etsin. Həqiqətən, O bəxşiş verəndir. Allah daha yaxşı bilir!

*Muhəmmədə, onun ailəsinə və səhabələrinə Allahın salavatı və çoxlu salamı olsun!*

---

[51] Əhməd rəvayət etmişdir.
[52] ət-Tirmizi rəvayət etmişdir.
[53] əl-Buxari və Muslim rəvayət etmişdir.